

**Ayətullah Müctəhidi**

**Dörd risalə**

*Rəhman və Rəhim Allahın adı ilə*

Qarşınızdakı risalə həzrət Ayətullah Müctəhidiyə məxsusdur. Bu şəxsin bizlər və elmi mərkəzlər üçün böyük zəhmətləri olmuşdur. Risalənin mənim nəzarətimlə çapa getməsi müəllifin arzusu idi. Kitabın Qum elmi mərkəzinin ustadları tərəfindən tərtibini münasib gördüm. Bu iş müvəffəqiyyətlə başa çatdırıldı. Ümid edirəm ki, müəllif və əziz oxucular tərəfindən qəbul olunacaq.

Qum, Riza Ustadi
Bahar, 2006.

# BİRİNCİ RİSALƏ

## *İrs qanunlari*

### *MÜQƏDDİMƏ*

Bu vaxtadək geniş oxucu kütləsinin istifadə edəcəyi irs kitabı mövcud deyildi. Çoxları irs bölməkdə çətinliyə düçar olur, səhvə yol verirdilər. İnsanların irs məsələləri ilə rahatlıqla tanış ola bilməsi üçün bu müxtəsər risaləni hazırladım.

### *VARİSLƏRİN TƏBƏQƏLƏRİ*

**Birinci təbəqə:** övlad, ata, ana, övlad olmadıqda nəvə və nəticələr;

**İkinci təbəqə:** bacı, qardaş, babalar, nənələr, bacı və qardaş olmadıqda bacının övladları və qardaşın övladları; bacı və qardaş bə`zən ata və anadan, bə`zən təkcə atadan, bə`zən isə təkcə anadan doğma olur. Eyni qisimdən olduqda bütün mal götürülür; ata və anadan doğma qardaş iki pay, bacı bir pay götürür. Amma təkcə anadan doğma olan qardaş və bacı bərabər miqdarda irs götürür.

Əgər varislər arasında həm ata-anadan, həm atadan, həm də anadan doğma qardaş-bacılar varsa, yalnız ata-anadan və anadan doğma olan bacı-qardaşlar irs götürür; ata-anadan doğma bacı-qardaşların olması atadan doğma bacı-qardaşların irs götürməsinə mane olur; əgər ata-anadan doğma bacı-qardaşlar yoxdursa, atadan doğma bacı qardaşlar irs götürür; anadan doğma bacı və qardaş bir nəfərdirsə, malın altıda biri onundur. Əgər onların sayı bir nəfərdən çox olsa, malın üçdə biri onlara düşür. Həmin malı öz aralarında bərabər bölürlər.

**Üçüncü təbəqə:** bibilər, əmilər, xalalar, dayılar, onlar olmadıqda övladları. (bu risalədə üçüncü təbəqənin məsələləri açıqlanmır.)

**Xatırlatma:** Ər və arvad bütün təbəqələr olduqda belə, bir-birlərindən irs götürürlər.

### *ÖVLAD, NƏVƏ VƏ NƏTİCƏNİN HÖKMÜ*

Ata və ana, ya ərlə arvad oğul və ya qız övladlarla vərəsəlikdə şərik olsalar, övlad sağ olmadığı təqdirdə onun övladları ata və analarının yerini tutur; onlar ata-ana və ya meyitin əri və ya arvadı ilə varislikdə iştirak edirlər. Onların payı ata və analarının payı qədərindədir.

Əgər onun övladı qızdırsa, atasının irs payına sahib olur; qızın övladı oğlandırsa, anasının irs payını götürür; övladın övladları öz irs paylarını götürdükdən sonra öz aralarında bölürlər; oğlan qızdan iki pay artıq irs payı götürür; ən məşhur fətva budur; amma başqa rə`y də var: qız övladın irsi onun qızı və oğlu arasında bərabər bölünür; bu rə`y məşhur deyil. (Bu sayaq ixtilaflı məsələlərdə hər kəs öz təqlid etdiyi müctəhidə müraciət etsin.)

### *İRS MƏSƏLƏLƏRİ (BİRİNCİ TƏBƏQƏ)*

İrs təbəqələri və varislərin qisimləri nəzərə alınaraq onlara aid məsələlər zikr olunur:

Məsələ 1: Əgər ata yeganə varis olsa, bütün irs ona çatır.

Məsələ 2: Əgər ana tənha varis olsa, bütün irs ona çatır.

Məsələ 3: Əgər ər yeganə varis olsa, bütün irs ona çatır.

Məsələ 4: Əgər ərin yeganə varisi onun arvadıdırsa, arvad bütün irsdən dörddə bir pay götürür. Əgər başqa arvadlar da varsa, onların da hər birinə dörddə bir pay verilir. İrsin qalan hissəsi imamı ixtiyarındadır. Arvad torpaqdan irs payı götürmür. Bu məsələdə ixtilaf olduğundan hər kəs öz təqlid etdiyi müctəhidə müraciət etsin.

Məsələ 5: Ailənin yeganə övladı olan oğlan bütün irsə sahibdir.

Məsələ 6: Ailənin yeganə övladı olan qız bütün irsə sahibdir.

Məsələ 7: Əgər bir neçə oğul varsa, bütün irs onlar arasında bərabər bölünür.

Məsələ 8: Əgər varis bir neçə qızdırsa, bütün mal onlar arasında bərabər bölünür.

Məsələ 9: Əgər bir neçə oğul və bir neçə qız övlad varsa, oğlan övladlar iki pay, qız övladlar isə bir pay götürür.

Məsələ 10: Əgər varis ata və anadırsa, bütün irs üç hissəyə bölünür: üçdə bir pay anaya çatır, qalan irsi ata götürür. Əgər meyitin ən azı iki qardaşı və ya dörd bacısı, ya bir qardaşı, iki bacısı olsa, bu halda irs altı hissəyə bölünür: ana altıda bir pay götürür, qalan irs ataya çatır.

Məsələ 11: Əgər varis ata və bir qızdırsa, irsin dörddə bir hissəsi ataya, qalan üç hissəsi qıza çatır. Çünki ilkin halda atanın payı altıda birdir; Qur`ana görə qızın payı yarıdır. Yerdə qalan altıda iki hissə dörd hissəyə bölünür, bir hissə ataya, üç hissə qıza çatır; nəticə budur ki, mal dörd hissəyə bölünür, bir hissə ataya və üç hissə qıza çatır. Məsələn, məbləğ 60 min manat olarsa, 15 min manat atanın, 45 min manat qızın payına düşür.

Məsələ 12: Əgər varis ata və bir neçə qız olarsa, bütün mal beş hissəyə bölünür: bir hissə ataya çatır, qalan dörd hissə qızlar arasında bərabər bölünür. Məsələn, əgər məbləğ 60 min manatdırsa, 12 min manat atanın payına düşür, qalan hissə qızlar arasında bərabər bölünür. Çünki atanın payı altıda birdir, qızların payı üçdə iki. Qalan altıda bir hissə beş hissəyə bölünür, beşdə bir ataya verilir və qalan dörd hissə qızlar arasında

bölünür. Nəticədə mal beş hissəyə bölünmüş olur: bir hissə ataya verilir, dörd hissə qızların payına düşür.

Məsələ 13: Əgər varis ata və bir oğuldursa, irsin altıda biri atanın, qalan hissəsi oğulun payına düşür.

Məsələ 14: Əgər varis ata və bir neçə oğul, bir neçə qızdırsa, ata irsindən altıda bir pay alır, qalan hissə oğlanlar və qızlarındır. Oğlanlar iki pay, qızlar bir pay götürür.

Məsələ 15: Əgər varis ata və ərdirsə, irsin yarı hissəsi ərin, qalan hissəsi atanındır.

Məsələ 16: Əgər varis arvad (zövcə) və atadırsa, zövcəyə dörddə bir pay düşür, qalan hissə ataya aiddir.

Məsələ 17: Əgər varis ana və bir qızdırsa, bütün mal dörd hissəyə bölünür: bir hissə ananın payıdır, qalan hissə qızın.

Məsələ 18: Əgər varis ana və bir neçə qızdırsa, bütün mal beş hissəyə bölünür, bir hissə ananın, dörd hissə qızların payıdır. Qızlar həmin payı öz aralarında bərabər bölürlər.

Məsələ 19: Əgər varis ana və bir neçə oğuldursa, malın altıda biri ananın, qalan hissə oğlanların payına düşür.

Məsələ 20: Əgər varis ana, bir neçə oğul və bir neçə qızdırsa, malın altıda biri ananın payıdır. Qalan hissə oğlanlara və qızlara məxsusdur, oğlanlar iki pay və qızlar bir pay götürür.

Məsələ 21: Əgər varis ana və ərdirsə, malın yarısı ərin, qalan hissəsi ananındır.

Məsələ 22: Əgər varis ana və zövcədirsə, zövcəyə dörddə bir pay verilir, qalan hissə anaya aiddir.

Məsələ 23: Əgər varis ata, ana və bir qızdırsa, irsin altıda biri atanın, altıda biri ananın və bütün irsin yarısı qızın payına düşür. Əgər meyitin ən azı iki qardaşı və dörd bacısı, ya da bir qardaşı və iki bacısı olarsa, qalan

altıda bir hissə beş yerə bölünür, bir hissə ataya, bir hissə anaya verilir, qalan üç hissə qızın payıdır. Əgər meyit deyilən şəraitdə olmasa qalan altıda bir hissə dörd yerə bölünür, bir hissə ataya, üç hissə qıza verilir.

Məsələ 24: Əgər varis ata, ana və birdən artıq qız olarsa, malın altıda birini ata, altıda birini ana götürür, qalan üçdə iki hissəsi qızlar arasında bərabər bölünür.

Məsələ 25: Əgər varis ata, ana, oğlanlar və qızlardan ibarət övladlardırsa, malın altıda biri ataya, altıda biri anaya verilir və qalan hissə övladlarındır. Əgər övlad bir oğlandırsa, qalan hissə bütünlüklə ona çatır. Əgər bir neçə oğlandırsa, onların arasında bərabər bölünür. Əgər oğlan və qızlardan ibarətdirsə, oğlan iki, qız bir pay götürür.

Məsələ 26: Əgər varis ata, ana və ər olarsa, (və ana üçün "hacib" olmazsa) ər malın yarısını götürür, ataya altıda bir, anaya altıda iki pay düşür. Əgər ana üçün "hacib" şərti olarsa, ər yarı pay götürür, ataya altıda iki, anaya altıda bir pay düşür.

Məsələ 27: Əgər varis ata-ana və zövcə olarsa, zövcə ümumi irsdən dörddə bir pay götürər: əgər ana üçün "hacib" şərti olarsa, ümumi irsin üçdə biri ananındır. Əgər şərt yoxdursa, anaya altıda bir pay düşür və qalan hissə atanındır.

Məsələ 28: Əgər varis ata, ər və bir qız olarsa, ər ümumi irsdən dörddə bir pay götürür, ataya altıda bir pay çatır, qız isə malın yarısına sahib olur. Qalan on ikidə bir hissə dörd hissəyə bölünür, bir hissə ataya, qalan hissə qıza verilir.

Məsələ 29: Əgər varis ata, ər və birdən artıq qız olarsa, ata ümumi irsdən altıda bir pay alır, ər dörddə bir götürür. Qalan hissə qızlar arasında bərabər bölünür. (Qızlar yarı pay götürməli olsa da, ortaya şərt çıxdığından onların payı azalır.)

Məsələ 30: Əgər varis ata, ər, oğlan övlad və ya oğlan və qız övladlar olarsa, ata ümumi irsdən altıda bir pay alır. Ərə dörddə bir pay düşür. Qalan hissə övladlarındır. Əgər cəmi bir oğlan övladdırsa, qalan hissə bütünlüklə ona çatır. Əgər bir neçə oğlandırsa, qalan hissə bərabər şəkildə onların arasında bölünür. Əgər oğlan və qız övladlar varsa, oğlan iki pay, qız bir pay götürür.

Məsələ 31: Əgər varis ata, zövcə, bir qızdırsa, ümumi irsdən ataya altıda bir, zövcəyə səkkizdə bir pay düşür. Əgər zövcələr çoxdursa, həmin səkkizdə bir payı öz aralarında bölürlər. Qız ümumi irsin yarısına sahib olur. Qalan iyirmi dörddə beş hissə dörd hissəyə bölünür, bir hissə ata, üç hissə qız götürür. Zövcələrin səkkizdə bir payı götürüldükdən sonra qalan mal dörd hissəyə bölünür və ata ilə qız arasında bölünür.

Məsələ 32: Əgər varis ata, zövcə və birdən artıq qızdırsa, ümumi irsin altıda biri ataya, səkkizdə biri zövcəyə çatır. Qızlar ümumi irsin üçdə ikisinə sahib olur. Onlar bu payı öz aralarında bərabər bölür. Yerdə qalan iyirmi dörddə bir hissə ata ilə qızlar arasında bərabər bölünür. İyirmi dörddə bir hissə beş hissəyə bölünür, bir hissə ata, dörd hissə qızlar götürür.

Məsələ 33: Əgər varis ata, zövcə, oğlan övlad və ya oğlan və qız övladlar olarsa, ata ümumi irsdən altıda bir pay götürür. Zövcəyə səkkizdə bir pay çatır. Qalan mal övladlarındır. Əgər övlad bir oğlandırsa, qalan hissə bütünlüklə ona çatır. Əgər bir neçə oğlandırsa, həmin hissə oğlanlar arasında bərabər bölünür. Əgər bir neçə oğlan və bir neçə qızdırsa, oğlanlar iki, qızlar bir paya sahib olur.

Məsələ 34: Əgər varis ana, ər və bir qız olarsa, ana ümumi irsdən altıda bir, ər dörddə bir pay götürür. Qız ümumi irsin yarısına sahib olur. Yerdə qalan on ikidə bir

hissə dörd yerə bölünür, bir hissə anaya,  üç hissə qızlara çatır.

Məsələ 35: Əgər varis ana, ər və birdən artıq qız olarsa, ümumi irsdən ana altıda bir, ər dörddə bir pay götürür. Qalan hissə qızlar arasında bərabər bölünür. Qızların payı üçdə iki olmalıdırsa da, məsələ şərtləndiyindən onlara az pay düşür.

Məsələ 36: Əgər varis ana, ər, oğlan övlad və ya oğlan və qız övladdırsa, irsdən altıda bir pay anaya, dörddə bir pay ərə düşür. Qalan hissə övladlarındır. Əgər bir oğul olarsa, qalan hissə bütünlüklə ona çatır. Əgər bir neçə oğlandırsa, qalan hissə onlar arasında bərabər bölünür. Əgər oğlan və qız övladlar varsa, oğlan iki, qız bir pay götürür.

Məsələ 37: Əgər varis ana, zövcə və bir qızdırsa, ümumi irsdən ana altıda bir, zövcə səkkizdə bir pay götürür. Qız ümumi irsin yarısına sahib olur. Malın qalan iyirmi dörddə beş hissəsi dörd hissəyə bölünür: bir hissə anaya, üç hissə qıza çatır. Belə ki, zövcənin səkkizdə bir payını ayırdıqdan sonra mal beş yerə bölünür: bir pay anaya, dörd pay qızlara düşür.

Məsələ 38: Əgər varis ana, zövcə, bir oğul, ya bir neçə oğul, ya bir neçə oğulla qız olarsa, ümumi irsin altıda biri ananın, səkkizdə biri zövcənin, qalan hissə övladların payıdır. Əgər bir oğlan övlad olarsa, övladların payı ona düşər. Əgər bir neçə oğulsa, övladların payını bərabər bölürlər. Əgər oğlan və qız övladlar varsa, oğlan iki pay, qız bir pay götürür.

Məsələ 39: Əgər varis ata, ana, ər və bir qız olarsa, ata və ana hər biri maldan altıda bir pay, ər dörddə bir pay götürür. Qıza ümumi irsin yarısı düşməli olsa da, ər olduğundan onun payı əskilir. Məsələn, 60 min manatdan 10 min manatı atanın, 10 min manatı ananın payına düşür, 15 min manat ərə çatır. Qalan 25 min

manat qızın payıdır. Qızın payı yarı olmalıdırsa da, o 30 min manat yox, 15 min manat alır.

Məsələ 40: Əgər varis ata, ana, ər və birdən artıq qız olarsa, ata və ana hər biri altıda bir pay alır, ər dörddə bir pay götürür. Malın qalanı qızlar arasında bərabər bölünür. İrsin üçdə ikisi qızlara çatmalı olsa da, ata-ananın və ərin haqqı müqəddəmdir, ona görə də qızların payı azalır.

Məsələ 41: Əgər varis ata, ana, ər, oğlan övlad, ya oğlan və qız övladlardırsa, ata və ana hər biri altıda bir pay, ər dörddə bir pay alır, Övladlar oğlandırsa, qalan mal onların arasında bərabər bölünür. Əgər oğlan və qız övladlar varsa, oğlanlar iki pay, qızlar bir pay alır.

Məsələ 42: Əgər varis ata, ana, zövcə və bir qızdırsa, ata və ana hər biri altıda bir pay götürür, səkkizdə bir pay zövcəyə çatır. Qız ümumi malın yarısına sahib olur. Qalan hissə beş yerə bülünür, bir hissə ataya, bir hissə anaya və üç hissə qıza verilir. Amma ana üçün "hacib" şərti olarsa, o beş hissədən bir pay götürür. Qalan mal dörd yerə bölünür, bir hissə ataya, üç hissə qızlara düşür.

Məsələ 43: Əgər varis ata, ana, zövcə və birdən artıq qızdırsa, ata və ana hər biri ümumi irsdən altıda bir pay alır, zövcə səkkizdə bir pay götürür, qalan hissə qızlar arasında bərabar bölünür.

Məsələ 44: Əgər varis ata, ana, oğlan və qız övladları olan zövcədirsə, ata və ana hər biri altıda bir pay alır, zövcə səkkizdə bir pay götürür. Əgər oğul bir övladdırsa, qalan mal bütünlüklə ona çatır. Əgər bir neçə oğlandırsa, qalan mal onlar arasında bərabər bölünür. Əgər övladlar oğlan və qızlardırsa, oğlanlar iki, qızlar bir pay alır.

Məsələ 45: Əgər varis ər və bir neçə qızdırsa, ər dörddə bir pay alır, qalan hissə qıza çatır.

Məsələ 46: Əgər varis ər, birdən artıq qızdırsa, ər dörddə bir pay alır, qalan hissə qızlar arasında bərabər bölünür.

Məsələ 47: Əgər varis oğlan övladları və ya qız və oğlan övladları olan ərdirsə, ər ümumi irsdən dörddə bir pay alır, qalan hissə övladlarındır. Əgər övlad bir oğlandırsa, qalan hissə bütünlüklə ona çatır. Əgər bir neçə oğlandırsa, mal onlar arasında bərabər bölünür. Əgər övladlar oğlan və qızlardırsa, oğlan iki pay, qız bir pay götürür.

Məsələ 48: Əgər varis bir qızı olan zövcədirsə, zövcə səkkizdə bir pay götürür, qalan hissə qıza çatır.

Məsələ 49: Əgər varis zövcə və birdən artıq qızdırsa, zövcə səkkizdə bir pay götürür, qalan hissə qıza çatır.

Məsələ 50: Əgər varis zövcə, oğlan övlad və ya oğlan və qız övladdırsa, zövcə səkkizdə bir pay götürür, qalan hissə övladlarındır. Övlad bir oğlandırsa, qalan hissə bütünlüklə ona çatır. Əgər bir neçə oğlandırsa, onların arasında bərabər bölünür. Əgər övladlar oğlan və qızlardırsa, oğlan iki pay, qız bir pay götürür.

Məsələ 51: Əgər bir şəxs dünyadan getdiyi vaxt onun bütün övladları özündən qabaq dünyasını dəyişmiş olsa, amma oğul və ya qız nəvələri qalsa, oğlan nəvələri (oğlunun övladları) atalarının, qız nəvələri analarının payına sahib olur. Oğlan nəvələri öz paylarını, qız nəvələri öz paylarını öz aralarında bölürlər. Oğlan iki, qızlar bir pay götürür. Nə qədər ki, övlad var, nəvəyə irs düşmür. Nə qədər ki, nəvə var, nəticəyə irs düşmür.

Məsələ 52: Nəvə də övlad kimidir. O ata, ana, zövcə və ər kimi irsdən pay alır.

## *İRS MƏSƏLƏLƏRİ (İKİNCİ TƏBƏQƏ)*

Məsələ 53: İkinci varis təbəqəsi bacı, qardaş, baba və nənədir; bacı və qardaş, qardaşın övladı və bacının övladı olmadıqda, baba və nənə irsə sahib olur.

Məsələ 54: Əgər varis ata-anadan doğma bir bacıdırsa, bütün irs ona çatır. Ata-anadan doğma bacı olmadıqda, atadan doğma bacı irsə sahib olur.

Məsələ 55: Əgər varis ata-anadan doğma bir neçə bacıdırsa, bütün irs onlara çatır və onlar bu irsi öz aralarında bölürlər.

Məsələ 56: Əgər varis ata-anadan doğma bacı və qardaşdırsa, qardaş iki, bacı bir pay götürür.

Məsələ 57: Əgər varis ata-anadan doğma bir qardaşdırsa, bütün irs ona çatır. Bir neçə qardaş olarsa, irsi aralarında bərabər bölərlər.

Məsələ 58: Əgər varis atadan doğma bacılardırsa, bütün irs onlara çatır.

Məsələ 59: Əgər varis atadan doğma qardaş və bacılardırsa, bütün irs onlara çatır: qardaş iki pay, bacı bir pay götürür.

Məsələ 60: Əgər varis atadan doğma qardaşdırsa, bir nəfər olduqda bütün mal ona çatır, bir neçə nəfər olduqda aralarında bərabər bölürlər.

Məsələ 61: Əgər varis anadanbir qardaş və ya bacıdırsa, bütün irs ona çatır.

Məsələ 62: Əgər varis anadanbir neçə bacı və ya anadanbir neçə qardaşdırsa və ya birlikdə anadanbir bir neçə bacı və bir neçə qardaşdırsa, bütün malı aralarında bərabər bölürlər. Bu halda qardaş və bacının eyni miqdarda irs götürməsinin səbəbi onların anadanbir olmasıdır.

Məsələ 63: Əgər varis yalnız anadanbir bir neçə qardaşdırsa, bütün malı aralarında bərabər bölürlər.

Məsələ 64: Əgər varis yalnız bir neçə anadanbir bacıdırsa, bütün mal onların arasında yarı bölünür.

Məsələ 65: Əgər varis atadanbir bacı və qardaş, ata-anadanbir bacı və qardaşlardırsa, atadanbir bacı və qardaş irs götürür. İrs yalnız ata-anadanbir bacı və qardaş arasında bölünür: qardaş iki pay, bacı bir pay götürür.

Məsələ 66: Əgər varis ata-anadanbir bacı və qardaş, atadanbir bacı və qardaş, anadanbir bacı və qardaşdırsa, atadanbir bacı və qardaş irsdən məhrumdur. Əgər anadanbir bacı və qardaş bir nəfərdirsə, irsin altıda birinə sahib olur, əgər bir neçə nəfərdirsə, irsin üçdə birini aralarında bərabər bölür. Qalan mal ata-anadanbir bacı və qardaşlar arasında bölünür: qardaş iki pay, bacı bir pay götürür.

Məsələ 67: Əgər varis ata-anadanbir bacı və qardaş, anadanbir bacı və qardaş olarsa, anadanbir bacı və qardaş bir nəfər olduqda, altıda bir pay alır. Birdən artıq olduqda malın üçdə birini öz aralarında bölürlər. Qalan mal ata-anadanbir bacı və qardaş üçündür. Qardaş iki pay, bacı bir pay götürür.

Məsələ 68: Əgər varis atadanbir bacı və qardaş, ata-anadanbir bacı və qardaşsa, atadanbir bacı və qardaş irsdən məhrumdur. Əgər ata-anadanbir övladlar bir nəfər olarsa, bütün irsə sahib olar. Əgər bir neçə nəfər olarsa, oğlanlar iki pay, qızlar bir pay götürər.

Məsələ 69: Əgər varis anadanbir bacı və qardaşla bir və ya bir neçə atadanbir qardaş olarsa, anadanbir bacı və qardaş bir nəfər olduqda altıda bir, bir neçə nəfər olduqda üçdə bir pay götürür. Onlar bu payı aralarında bərabər bölürlər. Malın qalanı qardaş və ya qardaşlara çatır.

Məsələ 70: Əgər varis anadanbir tək bacı və atadanbir tək bacıdırsa, anadanbir bacı altıda bir pay götürür, qalan hissə atadanbir bacıya çatır.

Məsələ 71: Əgər varis anadanbir tək bacı və ya qardaş, atadanbir qardaşlardırsa, anadanbir bacı və ya qardaş altıda bir pay götürür, qalan hissə atadanbir qardaşlar arasında bərabər bölünür.

Məsələ 72: Əgər varis anadanbir tək bacı, ata-anadanbir tək bacıdırsa, anadanbir bacı altıda bir pay götürür, qalan hissə ata-anadanbir bacıya çatır.

Məsələ 73: Əgər varis anadanbir tək bacı və atadanbir bir neçə bacıdırsa, anadanbir bacı altıda bir pay götürür, qalan hissəni ata-anadanbir bacılar bölür.

Məsələ 74: Əgər varis anadanbir tək bacı və ya qardaş, ata-anadanbir qardaşlarsa, anadanbir bacı və qardaş irsdən altıda bir pay götürür, qalan hissə ata-anadanbir qardaşlar arasında bərabər bölünür.

Məsələ 75: Əgər varis anadanbir bir qardaş və bir bacı, ata anadanbir bacılar və qardaşlarsa, anadanbir bacı və qardaş irsdən altıda bir pay götürür, qalan hissə ata-anadanbir bacı-qardaşlar arasında bölünür: qardaş iki, bacı bir pay götürür.

Məsələ 76: Əgər varis anadanbir bir neçə bacı və qardaş, atadanbir tək bacı olarsa, anadanbir bacılar və qardaşlar irsdən üçdə bir pay götürər və öz aralarında bölər. Qalan hissə atadanbir tək bacınındır.

Məsələ 77: Əgər varis anadanbir bir neçə bacı və qardaş, atadanbir bir neçə bacı olarsa, irsin üçdə biri anadanbir bacı-qardaşların payıdır. Qalan üçdə iki hissə atadanbir bacılarındır.

Məsələ 78: Əgər varis anadanbir bir neçə bacı və qardaş, atadanbir bir və ya bir neçə qardaşsa, anadanbir bacı və qardaşlar irsin üçdə birinə sahib olur. Qalan mal atadanbir qardaş və ya qardaşlarındır.

Məsələ 79: Əgər varis anadanbir bacılar və qardaşlar, ata-anadanbir bacılar və qardaşlarsa, anadanbir bacılar və qardaşlar irsin üçdə birinə sahib olur, qalan hissə anadanbir bacı və qardaşlarındır. Qardaşlar iki, bacılar bir pay götürür.

Məsələ 80: Əgər varis anadanbir bir neçə bacı və qardaş, ata-anadanbir tək bacıdırsa, anadanbir bacılar və qardaşlar irsdən üçdə bir pay götürür, qalan hissə ata anadanbir bacıya çatır.

Məsələ 81: Əgər varis anadanbir bir neçə bacı və qardaş, ata-anadanbir bacılarsa, irsin üçdə biri anadanbir bacı və qardaşlara çatır, qalan üçdə iki hissə ata-anadanbir bacılar arasında bərabər bölünür.

Məsələ 82: Əgər varis anadanbir bir neçə bacı və qardaş, ata-anadanbir tək və ya bir neçə qardaşsa, anadanbir bacılar və qardaşlar irsdən üçdə bir pay götürür, qalan hissə ata-anadanbir qardaş və ya qardaşlara çatır.

Məsələ 83: Əgər varis anadanbir bir neçə bacı və qardaş, ata-anadanbir bacılar və qardaşlarsa, malın üçdə biri anadanbir bacılar və qardaşlara çatır, qalan hissə ata-anadanbir bacılar və qardaşlar arasında bölünür: qardaşlar iki, bacılar bir pay götürür.

Məsələ 84: Əgər varis ər və atadanbir tək bacısa, malın yarı hissəsi ərə çatır, qalan yarı hissə atadanbir bacıya düşür.

Məsələ 85: Əgər varis ər, atadanbir bacılar olarsa, ər irsin yarısına sahib olur, qalan hissə bacılar arasında bərabər bölünür.

Məsələ 86: Əgər varis ər, atadanbir qardaş və ya qardaşlarsa, ər irsin yarısına sahib olur, qalan hissə atadanbir qardaş və ya qardaşlara çatır.

Məsələ 87: Əgər varis ər, atadanbir bacılar və qardaşlarsa, ər yarı pay götürür, qalan yarı bacı və

qardaşlara çatır. Qardaşlar iki, bacılar bir bir pay götürür.

Məsələ 88: Əgər varis ər, anadanbir tək bacı və qardaş olarsa, ər irsin yarı hissəsinə sahib olur, qalan hissə anadanbir bacı və qardaşa çatır.

Məsələ 89: Əgər varis ər, anadanbir neçə bacı və qardaşsa, ər irsin yarı hissəsinə sahib olur, qalan hissə bacı və qardaşlara çatır.

Məsələ 90: Əgər varis ər, ata-anadanbir tək bacı olarsa, yarı hissə ərə çatır, yarı hissə ata-anadanbir bacının ixtiyarına verilir.

Məsələ 91: Əgər varis ər, ata-anadanbir bacılar olarsa, irsin yarı hissəsi ərə, qalan hissə bacılara çatır. Onlar bu malı aralarında bərabər bölürlər.

Məsələ 92: Əgər varis ər, ata-anadanbir qardaş və ya qardaşlarsa, ər yarı pay götürür, qalan hissəsi isə qardaş və ya qardaşlara verilir.

Məsələ 93: Əgər varis ər, ata-anadanbir bacılar və qardaşlarsa, yarı pay ərə çatır, qalan hissə ata-anadanbir bacı və qardaşlar arasında bölünür.

Məsələ 94: Əgər varis zövcə və atadanbir bacısa, zövcə ümumi irsdən dörddə bir pay götürür, qalan hissə atadanbir bacıya çatır.

Məsələ 95: Əgər varis zövcə, atadanbir bacılarsa, zövcə dörddə bir pay götürür, qalan hissə bacılar arasında bərabər bölünür.

Məsələ 96: Əgər varis zövcə, atadanbir qardaş və ya qardaşlarsa, zövcə dörddə bir pay götürür, qalan hissə qardaş və ya qardaşlara çatır.

Məsələ 97: Əgər varis zövcə, anadanbir bacılar və qardaşlarsa, zövcə ümumi irsdən dörddə bir pay götürür, qalan hissə atadanbir bacılar və qardaşlar arasında bölüşdürülür. Qardaş iki pay, bacı bir pay götürür.

Məsələ 98: Əgər varis zövcə, anadanbir qardaş və bacı olsa, zövcə ümumi irsdən dörddə bir pay götürür, qalan hissə atadanbir bacı və qardaşa çatır.

Məsələ 99: Əgər varis zövcə, anadanbir bir neçə bacı və bir neçə qardaşsa, zövcə ümumi irsdən dörddə bir pay alır, anadanbir bacılar və qardaşlar qalan hissəyə sahib olur.

Məsələ 100: Əgər varis zövcə və ata-anadanbir bacısa, zövcə dörddə bir pay götürür, qalan hissə ata-anadanbir bacıya çatır.

Məsələ 101: Əgər varis zövcə və ata-anadanbir bacılarsa, zövcə ümumi irsdən dörddə bir pay götürür, qalan hissə ata-anadanbir bacılar arasında bərabər bölünür.

Məsələ 102: Əgər varis zövcə, ata-anadanbir bacılar və qardaşlarsa, zövcə dörddə bir pay götürür, qalan hissə ata-anadanbir bacılar və qardaşlar arasında bölünür. Qardaş iki pay, bacı bir pay götürür.

Məsələ 103: Əgər meyitin istər ata-anadan, istər təkcə ata və ya anadanbir bacıları və qardaşları sağ deyilsə, onların övladları (meyitin qardaşı və bacısı övladları) hamılıqla varisdirlər və ata-analarının payına sahib olurlar. Məsələn, meyitin ata-anadanbir qardaşı və bacısı övladları ata-anadanbir qardaş və bacının payına sahib olurlar.

Anadanbir qardaş və bacının övladları anadanbir bacı və qardaşın payını götürür.

Ata-anadanbir qardaş və bacı övladları olan halda atadanbir qardaş və bacı övladları pay götürmür. Əgər qardaş və bacı övladları yoxsa, qardaş və bacının nəvələri varisdir. Əgər qardaş və bacının nəvələri də yoxsa, onların nəticələri varisdir.

Məsələ 104: İkinci təbəqə varislikdə bacılar və qardaşlardan əlavə, meyitin baba və nənələri də varis

olur. Atanın ata-anası, ananın ata-anası meyitin birinci mərtəbə əcdadı sayılır. Birinci mərtəbə əcdadın varlığı, ikinci mərtəbə əcdadın varisliyinə mane olur. İkinci, üçüncü, dördüncü mərtəbə əcdadların hökmü ilə tanış olmaq istəyənlər təqlid etdikləri müctəhidin risaləsinə müraciət etsinlər.

Məsələ 105: Əgər varis ata-ana tərəfindən bir baba və ya bir nənədirsə, bütün mal ona çatır.

Məsələ 106: Əgər varis ata tərəfindən baba ilə nənədirsə, bütün mal onlar arasında bölünür. Babaya iki pay, nənəyə bir pay çatır.

Məsələ 107: Əgər varis ana tərəfindən baba ilə nənədirsə, bütün mal onların arasında bərabər bölünür.

Məsələ 108: Əgər varis ata və ana tərəfindən əcdadlardırsa, irsin üçdə ikisi ata tərəfindən əcdada, üçdə biri isə ana tərəfindən əcdada çatır. Ata tərəfindən olan baba iki pay, nənə isə bir pay götürür. Ana tərəfindən olan baba və nənə paylarına düşəni yarı bölürlər.

Məsələ 119: Əgər varis ata tərəfindən və ana tərəfindən baba olarsa, irsin üçdə ikisi ata tərəfindən babaya, üçdə biri ana tərəfindən babaya düşür. Başqa bir rə`yə görə, ata tərəfindən baba altıda beş, ana tərəfindən baba altıda bir pay alır. Bu və bundan sonrakı dörd məsələdə təqlid edilən müctəhidin fətvasına əməl olunmalıdır.

Məsələ 110: Əgər varis ata tərəfindən baba və ana tərəfindən nənədirsə, ata tərəfindən baba irsin üçdə ikisini, ana tərəfindən nənə irsin üçdə birini götürür. İkinci rə`yə görə ata tərəfindən baba altıda beş, ana tərəfindən nənə altıda bir pay alır.

Məsələ 111: Əgər varis ata tərəfindən nənə və ana tərəfindən baba olarsa, ata tərəfindən nənə üçdə iki, ana tərəfindən baba üçdə bir pay alır. İkinci rə`yə görə ata

tərəfindən nənəyə altıda beş, ana tərəfindən babaya altıda bir pay düşür.

Məsələ 112: Əgər varis ata tərəfindən nənə və ana tərəfindən nənədirsə, ata tərəfindən nənə üçdə iki, ana tərəfindən nənə üçdə bir pay alır. İkinci rə`yə görə ata tərəfindən nənəyə dörddə üç, ana tərəfindən nənəyə dörddə bir pay düşür.

Məsələ 113: Əgər varis ata tərəfindən baba və nənə, ana tərəfindən baba və ya nənə olarsa, ata tərəfindən baba və nənə ümumi irsin üçdə ikisinə sahib olur, qalan üçdə bir pay ana tərəfindən baba və nənəyə düşür. İkinci rə`yə əsasən ata tərəfindən baba altıda beş pay alır, ana tərəfindən baba və nənəyə altıda bir pay düşür.

Məsələ 114: Əgər varis ana tərəfindən baba və nənə, ata tərəfindən baba və ya nənə olarsa, ata tərəfindən olan baba və nənə üçdə iki pay, ana tərəfindən olan baba və nənə üçdə bir pay götürür. Sonuncular götürdükləri payı aralarında bərabər bölür.

Məsələ 115: Əgər varis ata tərəfindən baba və nənə, ata-anadan və atadanbir bacı və qardaş olarsa, bütün mal baba, nənə, bacı və ya qardaş arasında bölünər: kişi iki pay, qadın bir pay götürər.

Məsələ 116: Əgər varis ata tərəfindən baba və nənə, təkcə bacılar və ya bacılarla qardaşlar olarsa (ata anadanbir və ya atadanbir), bütün mal onlar arasında bölünər, kişilər iki pay, qadınlar bir pay götürər. Əlbəttə ki, anadanbir qardaş və bacılar olduqda atadanbir olanlar irs almır. Ata-anadanbir qardaş və bacılar olmadıqda atadanbir olanlar irsdən pay almır.

Məsələ 117: Əgər varis ata tərəfindən baba-nənə, anadanbir bacı, ya qardaş, ya da anadanbir bacılar və qardaşlarsa, bacı və ya qardaş bir nəfər olduqda irsdən altıda bir pay alır. Əgər bir nəfər olarsa, malın üçdə biri onlar arasında bərabər bölünür, qalan hissə ata

tərəfindən baba-nənəyə çatır. Kişi iki pay, qadın isə bir pay götürür.

Məsələ 118: Əgər varis ata tərəfindən baba və nənələr, eləcə də ərsə, ər ümumi irsin yarısını götürür. Qalan yarı ata tərəfindən baba və nənə arasında bölünür.

Məsələ 119: Əgər varis ata tərəfindən baba və nənənlər, eləcə də zövcəsə, zövcə ümumi irsin dörddə birini götürür, qalan hissə ata tərəfindən baba-nənələr arasında bölünür.

Məsələ 120: Əgər varis ana tərəfindən acdad və ərsə, ər ümumi irsin yarısını götürür, qalan hissə ana tərəfindən əcdad arasında bərabər bölünür.

Məsələ 121: Əgər varis ana tərəfindən əcdad və zövcəsə, zövcə ümumi irsdən dörddə bir pay alır. Dörddə üç hissə ana tərəfindən əcdad arasında bərabər bölünür.

Məsələ 122: Əgər varis ana tərəfindən əcdad, ata-anadanbir bacı və ya onlar olmadıqda atadanbir bacısa, ana tərəfindən əcdad üçdə bir pay götürür, qalan hissə ata-anadanbir bacıya, o olmadıqda atadanbir bacıya çatır.

Məsələ 123: Əgər varis ana tərəfindən əcdad, ata-anadanbir bacılar və ya onlar olmadıqda atadanbir bacılarsa, ana tərəfindən əcdad üçdə bir pay götürür, qalan üçdə iki hissə ata-anadanbir bacılar və ya onlar olmadıqda atadanbir bacılar arasında bərabər bölünür.

Məsələ 124: Əgər varis ana tərəfindən əcdad, ata-anadanbir və ya atadanbir bir qardaş, ya bir neçə qardaş, ya bir neçə bacısa, ana tərəfindən əcdad üçdə bir pay götürür. Qalan üçdə iki hissə bir qardaş olduqda tamamilə ona çatır, bir neçə qardaş olduqda aralarında bərabər bölünür. Əgər varis bacılar və qardaşlarsa, götürülən payı öz aralarında bölürlər. Ata-anadanbir

övladlar olduqda atadanbir övlad pay almır. Əgər ata-anadanbir övlad yoxsa, atadanbir övlad varis sayılır.

Məsələ 125: Əgər varis ana tərəfindən əcdad, anadanbir bacı, ya qardaş, ya bir neçə bacı və qardaşsa, hamısı bir dərəcədədir və bütün mal onlar arasında bərabər bölünür.

Məsələ 126: Əgər varis ata tərəfindən əcdad, ata-anadanbir və ya atadanbir bacı, anadanbir bacı və qardaşsa, anadanbir bacı və qardaş altıda bir pay götürür, qalan irs ata tərəfindən əcdad və ata-anadanbir və ya atadanbir bacı arasında bölüşdürülür.

Məsələ 127: Əgər varis ata tərəfindən əcdad, ata-anadan və ya atadanbir bacı və qardaş, anadanbir bacı və ya qardaş olarsa, anadanbir bacı və ya qardaş altıdabir pay götürür, qalan hissə ata tərəfindən əcdad və ata-anadanbir və ya atadanbir bacı və qardaş arasında bölüşdürülür.

Məsələ 128: Əgər varis ata tərəfindən əcdad, ata-anadan və ya atadanbir bir neçə bacı və qardaş, anadanbir bacılar və qardaşlarsa, anadanbir bacılar və qardaşlar ümumi irsdən üçdə bir pay götürüb aralarında bölür, qalan üçdə iki hissə ata tərəfindən əcdadla ata-anadanbir bacı və qardaş arasında (onlar olmadıqda atadanbir olanlar arasında) bölünür.

Məsələ 129: Əgər varis ana tərəfindən əcdad, anadanbir bir və ya bir neçə bacı və ya qardaş, ata-anadan və ya atadanbir bir bacı, ya bacılar, ya qardaşlar və bacılarsa, ana tərəfindən əcdad anadanbir bir və ya bir neçə bacı və qardaşla ümumi irsdən üçdə bir pay götürür və öz aralarında bərabər bölürlər. Atadanbir bacı təkcə üçdə iki pay alır. Əgər bir neçə bacı olarsa, həmin üçdə iki payı öz aralarında bərabər bölürlər. Əgər bir neçə qardaş və bacı olarsa, üçdə iki pay onlara çatır. Kişilər iki, qadınlar bir pay götürür.

Məsələ 130: Əgər varis ər, anadanbir övladlarla ata-anadanbir və ya atadanbir bacılar və ya qardaşlarsa, ər ümumi irsin yarısını götürür, altıda bir pay anadanbir bacı və ya qardaşa, qalan hissə ata-anadanbir övladlara çatır. Onlar olmadıqda atadanbir övladlar pay alır. Bir qardaş və ya bir bacı olarsa, qalan hissə bütünlüklə ona çatır. Əgər bir neçə qardaş və ya bacı olarsa, qalan hissə onlar arasında bərabər bölünür. Kişilər iki, qadınlar bir pay götürür.

Məsələ 131: Əgər varis ər, anadanbir bacılar və qardaşlar, atadanbir və ya ata-anadanbir bir və ya bir neçə bacılarsa, ər ümumi irsin yarısına sahib olur, üçdə bir hissə anadanbir qardaşlar və bacılar arasında bölünür, qalan hissə atadan və ya ata-anadanbir bacılara çatır. Məsələ şərtlənmədikdə bacılar altıda üç pay almalı olsalar da, hazırkı halda onların payı azalır. Məsələn, 60 min manat irsdən 30 min manatı ərə çatır, 20 min manatı anadanbir bacılar və qardaşlara düşür, 10 min manatı ata-anadan və ya atadanbir bacılar üçün nəzərdə tutulur. Qızların payı ümumi irsin üçdə ikisi olsa da, vərəsəlikdə ərin iştirakı səbəbindən onların payı azalır.

Məsələ 132: Əgər varis ər, anadanbir bacılar və qardaşlar, ata-anadan və ya atadanbir bacılar və qardaşlarsa, ər ümumi irsdən yarı pay götürür, üçdə bir hissə anadanbir bacılar və qardaşlara, qalan altıda bir hissə isə ata-anadanbir övladlara çatır. Ata-anadanbir övladlar olmadıqda bu pay atadanbir övladlara verilir.

Məsələ 133: Əgər varis zövcə, anadanbir bir bacı və ya qardaş, ata-anadan və ya atadanbir bir bacısa, zövcə dörddə bir pay götürür, altıda bir pay anadanbir bacıya, ya qardaşa, qalan hissə ata-anadanbir bacıya düşür. Bu məsələdə başqa bir rə`y də var: uyğun məsələ ilə bağlı hər şəxs öz təqlid etdiyi müctəhidə müraciət etməlidir.

Məsələ 134: Əgər varis zövcə anadanbir bir bacı və ya qardaş, atadanbir və ya ata-anadanbir bacılar olarsa, zövcə ümumi irsdən dörddə bir pay götürər, altıda bir pay anadanbir bacı və ya qardaşa çatar, qalan hissə ata-anadanbir bacılara verilər. Ata-anadanbir bacı-qardaş olmadıqda atadanbir övlad varisdir. Ata-anadanbir övladlar olduqda, atadanbir övladlar pay götürmür.

Məsələ 135: Əgər varis zövcə, anadanbir bir bacı və ya qardaş, atadanbir və ya ata-anadanbir bir neçə qardaş və ya bacı olarsa, zövcə ümumi irsdən dörddə bir pay götürər, anadanbir bacılar və ya qardaşa altıda bir pay düşər, qalan hissə bir qardaş olduqda, bütünlüklə ona çatar, bir neçə qardaş olduqda aralarında bərabər bölünər. Əgər bir neçə bacı və qardaş olarsa, kişilər iki, qadınlar bir pay götürər. Ata-anadanbir övladlar olmadıqda atadanbir övladlar varisdir.

Məsələ 136: Əgər varis zövcə, anadanbir bacı və qardaş, ata-anadan və ya atadanbir bir bacısa, zövcə ümumi irsdən dörddə bir pay götürər, üçdə bir hissə anadanbir bacı və qardaşa çatar, yerdə qalan hissə ata-anadan və ya atadanbir bacıya verilər.

Məsələ 137: Əgər varis zövcə, anadanbir bacılar və qardaşlar, ata-anadanbir və ya atadanbir bacılarsa, zövcə dörddə bir pay götürər, üçdə bir pay anadanbir bacılara və qardaşlara düşər, qalan hissə ata-anadan və ya atadanbir bacılara çatar. Ata-anadanbir bacıların sayı üçdə iki olsa da, hazırkı məsələdə onlara az pay düşür.

Məsələ 138: Əgər varis zövcə ilə anadanbir bacı və qardaş, ata-anadanbir bir və ya bir neçə qardaş, ya da bir neçə bacı və ya qardaşsa, zövcə dörddə bir pay götürür, üçdə bir hissə anadanbir bacı və qardaşa çatır, qalan hissə o biri övladlara verilir. Ata-anadanbir övlad yeganədirsə, qalan hissə bütünlüklə ona çatır. Ata-anadanbir övlad olmadıqda, atadanbir övlad varis olur.

Məsələ 139: Əgər varis ərlə ana və ata tərəfindən əcdad olarsa, ər ümumi irsdən yarı pay alar, ana tərəfindən əcdad üçdə bir pay bölər, qalan hissə (altıda bir) ata tərəfindən əcdadlara verilər. Atanın atası iki pay, atanın anası bir pay götürər.

Məsələ 140: Əgər varis zövcə, ana tərəfindən və ata tərəfindən əcdadlarsa, zövcə dörddə bir pay götürər (zövcə birdən çox olarsa, dörddə bir onlar arasında bölünər), üçdə bir pay ana tərəfindən əcdadlara çatar, qalan hissə ata tərəfindən əcdadlara verilər. Atanın atası iki pay, atanın anası bir pay götürər.

Məsələ 141: Əgər varis ata tərəfindən və ana tərəfindən əcdadlar, anadanbir bir bacı və ya qardaşsa, ata tərəfindən əcdad üçdə iki pay götürür, üçdə bir pay ana tərəfindən əcdad və ondan bir bacı və ya qardaş arasında bərabər bölünür.

Məsələ 142: Əgər varis ata və ana tərəfindən əcdadlar, anadanbir bacılar və qardaşlarsa, ata tərəfindən əcdad üçdə iki pay götürür, qalan üçdə bir pay ana tərəfindən əcdadla anadanbir bacılar və qardaşlar arasında bərabər bölünür.

Məsələ 143: Əgər varis ata və ana tərəfindən əcdadlar, ata-anadan və anadanbir bir bacısa, ata tərəfindən əcdadla ata-anadan və ya atadanbir bacılar üçdə iki pay götürüb öz aralarında bölür, qalan üçdə bir pay ana tərəfindən əcdada düşür. Onlar bu payı öz aralarında bölürlər.

Məsələ 144: Əgər varis ata tərəfindən və ana tərəfindən əcdadlar, ata-anadan və ya atadanbir bacılarsa, ata tərəfindən əcdad ata-anadan və ya atadanbir bacılar və ya qardaş üçdə iki paya sahib olub aralarında kişiyə iki, qadına bir pay olmaqla bölürlər. Qalan hissə (üçdə bir) ana tərəfindən əcdadlar arasında

bərabər bölünür. Ata-andanbir bacı və qardaşlar olduqda atadanbir bacı və qardaşlara pay düşmür.

Məsələ 145: Əgər varis ərlə ata tərəfindən əcdad, ata-anadan və ya atadanbir bir bacı və ya qardaş, ya da bacılar və qardaşlarsa, ər ümumi irsdən yarı pay götürür, qalan hissə ata tərəfindən əcdadla, ata-anadanbir və ya atadanbir bir bacı və ya qardaş, bacılar və qardaşlar arasında bölünür.

Məsələ 146: Əgər varis ər, anadanbir bacı və qardaşla ata tərəfindən əcdadsa, ər irsdən yarı pay götürür, altıda bir hissə anadanbir bacı və ya qardaşa çatır, qalan üçdə bir hissə ata tərəfindən əcdada verilir.

Məsələ 147: Əgər varis ər, anadanbir bacı və qardaş, ata tərəfindən əcdadsa, ər ümumi irsdən yarı pay götürür, üçdə bir hissə anadanbir bacı və qardaş arasında bölünür, qalan altıda bir hissə ata tərəfindən əcdada çatır.

Məsələ 148: Əgər varis zövcə, ata tərəfindən əcdad, ata-anadanbir və ya atadanbir bacı və qardaş və ya bacılar və qardaşlarsa, zövcə dörddə bir pay götürür (zövcələr çox olduqda dörddə bir pay onların arasında bölünür), qalan dörddə üç hissə ata tərəfindən əcdadla ata-anadanbir bacı və qardaş, ya da bacılar və qardaşlar arasında bölünür. Ata-anadanbir bacı və qardaş yoxsa, atadanbir bacı və qardaş varis olur.

Məsələ 149: Əgər varis zövcə, ata tərəfindən əcdad, anadanbir bacı və ya qardaşsa, zövcə ümumi irsdən dörddə bir pay alır, altıda bir hissə anadanbir bacı, ya qardaşa çatır, qalan hissə ata-ana tərəfindən əcdada verilir.

Məsələ 150: Əgər varis zövcə, ata tərəfindən əcdad, anadanbir bir neçə bacı və qardaşsa, zövcə ümumi irsdən dörddə bir pay götürür, ümumi irsin üçdə biri anadanbir

bacı və qardaşa çatır, qalan hissə ata tərəfindən əcdada verilir.

Məsələ 151: Əgər varis ər, ana tərəfindən əcdad, ata-anadan və ya atadanbir bir bacısa, ər ümumi irsin yarısına sahib olur, ümumi irsin üçdə biri ana tərəfindən əcdada çatır, qalan hissə ata-anadan və ya atadanbir bacıya verilir.

Məsələ 152: Əgər varis ər, ana tərəfindən əcdad, ata-anadan və ya atadanbir bacılarsa, ər ümumi irsin yarısına sahib olur, ümumi irsin üçdə biri ana tərəfindən əcdada verilir, qalan hissə (altıda bir) ata-anadan və ya anadanbir bacılar arasında bölünür.

Qur`anda bacılara ümumi irsin üçdə ikisi çatdığı bildirilir. Məsələn, 60 min manat irsdən 40 min manatı onların payıdır. Hazırkı məsələdə isə bacılara nəzərdə tutulanın yarısı verilməlidir. Ata-anadanbir bacılar olmadıqda, atadanbir bacılar varisdir.

Məsələ 153: Əgər varis ər, ata tərəfindən əcdad, ata-anadan və ya atadanbir bacı və qardaşsa, ər yarı pay götürür, üçdə bir pay ana tərəfindən əcdada çatır, qalan hissə ata-anadan və ya atadanbir bacı və qardaşa verilir. Ata-anadanbir övladlar olduqda, atadanbir övladlar irsdən məhrumdur.

Məsələ 154: Əgər varis ər, ana tərəfindən əcdad, anadanbir bir və ya bir neçə bacı və ya qardaşsa, irsin yarısı ərə çatır, qalan yarı hissə atadanbir bacı və qardaşlarla ana tərəfindən əcdad arasında bərabər bölünür. Kişilər və qadınlar eyni pay götürür.

Məsələ 155: Əgər varis zövcə, ana tərəfindən əcdad, ata-anadan və ya anadanbir bir neçə bacısa, zövcə ümumi irsdən dörddə bir pay götürür, ana tərəfindən əcdada ümumi irsin üçdə biri verilir, qalan hissə ata-anadan və ya atadanbir bacıya çatır. Bu məsələdə də

tənha bacıya düşəsi yarı pay, bir neçə bacıya düşəsi üçdə iki pay azalır.

Məsələ 156: Əgər varis zövcə, ana tərəfindən əcdad, ata-anadan və ya atadanbir bir və ya bir neçə qardaş, ya bacı və qardaşsa, zövcə ümumi irsin dörddə birinə sahib olur, ümumi irsin üçdə biri ana tərəfindən əcdada çatır (aralarında bərabər bölünür), qalan hissə tənha qardaşa verilir. Bir neçə qardaş olduqda həmin pay onlar arasında bölünür. Əgər varis bacı və qardaşsa, qardaş iki, bacı bir pay götürür.

Məsələ 157: Əgər varis zövcə, ana tərəfindən əcdad, anadanbir bir və ya bir neçə bacı və qardaşsa, zövcə ümumi irsdən dörddə bir pay alır, qalan dörddə üç hissə ana tərəfindən əcdadla anadanbir qardaş və bacılar arasında bərabər bölünür.

Məsələ 158: Əgər varis ər, ata tərəfindən əcdad, ana tərəfindən əcdad, ata-anadan və ya atadanbir bir bacısa, ər ümumi irsin yarısına sahib olur, üçdə bir hissə ana tərəfindən əcdada çatır. Qalan altıda bir hissə ata tərəfindən əcdadla ata-anadan və ya atadanbir bacı arasında kişiyə iki pay, qadına bir pay qaydası ilə bölünür.

Məsələ 159: Əgər varis zövcə, ana tərəfindən əcdad, ata tərəfindən əcdad, ata-anadan və ya atadanbir bir bacısa, zövcə ümumi irsdən dörddə bir pay götürür, ümumi irsin üçdə biri ana tərəfindən əcdada çatır (aralarında bərabər bölürlər), qalan hissə ata tərəfindən əcdadla ata-anadan və ya atadanbir bacı arasında bölünür (kişiyə iki, qadına bir pay).

Məsələ 160: Əgər varis ata tərəfindən əcdad, ata-anadan və ya atadanbir bir və ya bir neçə bacı, ana tərəfindən əcdad, anadanbir bir və ya bir neçə bacı və ya qardaşsa, ata tərəfindən əcdad və ata-andan və ya atadanbir bir və ya bir neçə bacı ümumi irsdən üçdə iki

pay götürür. Bu pay kişilərə iki pay, qadınlara bir pay olmaqla arada bölünür. Qalan üçdə bir hissə ana tərəfindən əcdad və anadanbir bir və ya bir neçə bacı və qardaş arasında bərabər bölünür.

Məsələ 161: Əgər varis ata tərəfindən əcdad, ata-andan və ya atadanbir bacılar və qardaşlar, ana tərəfindən əcdad, anadanbir bir və ya bir neçə bacı və ya qardaşsa, ata tərəfindən əcdad və ata-anadan və ya atdanbir bacılar və qardaşlar ümumi irsin üçdə iki hissəsini götürüb öz aralarında kişilərə iki pay, qadınlara bir pay qaydası ilə bölür. Qalan üçdə bir hissə ana tərəfindən əcadala anadanbir bacı və qardaş arasında bərabər bölünür. Əgər ata-anadanbir bacı və qardaş olmasa, atadanbir bacı və qardaş varisdir.

Məsələ 162: Əgər varis ər, ata tərəfindən əcdad, ata-anadan və ya atadanbir bir və ya bir neçə bacı, ya da bacılar və qardaşlar, ana tərəfindən əcdadsa, ər ümumi irsdən yarı pay götürür, altıda bir hissə ata tərəfindən əcdadla ata-anadan və ya atadanbir bir və ya bir neçə bacı, ya da bacılar və qardaşlar arasında kişilərə iki pay, qadınlara bir pay qaydası ilə bölünür. Qalan altıda bir hissə ana tərəfindən əcdadın payıdır. Onlar bu payı öz aralarında bərabər bölürlər.

Məsələ 163: Əgər varis ər, ata tərəfindən əcdad, ana tərəfindən əcdad, atadanbir bir və ya bir neçə bacı və ya qardaşsa, ər ümumi irsdən yarı pay götürür, üçdə bir hissə ata tərəfindən əcdada çatır. Ata tərəfindən əcdad bu payı öz aralarında kişilərə iki pay, qadınlara bir pay qaydası ilə bölürlər. Qalan altıda bir hissə ana tərəfindən əcdad və anadanbir bir və ya bir neçə bacı və qardaşa çatır. Onlar bu payı öz aralarında bərabər bölürlər. Bu məsələ ilə bağlı başqa rə`ylər də var. Ətraflı mə`lumat almaq üçün təqlid etdiyiniz müctəhidin risaləsinə müraciət edin.

## *BİR NEÇƏ BAŞQA MƏSƏLƏ*

Məsələ 164: Qadının irs payı kişidən az olmaya bilər. Məsələn:

1. Ata-anadan və ya atadanbir bacı və qardaşın övladının irsi;
2. Anadanbir bacı və qardaşın irsi;
3. Qız olsa belə, oğul nəvənin irsi atasının payıdır; oğlan olsa belə, qız nəvənin irsi anasının payı qədərdir. Bu məsələdə qız oğlandan iki qat artıq irs götürür.

Məsələ 165: Qadın ərin yaşayış yerindən irs götürmür. Bağ, dükan və fabrik kimi qeyri-yaşayış yerləri ilə bağlı, təqlid etdiyi müctəhidə müraciət etmək daha yaxşı olar.

Məsələ 166: Əgər meyit malının üçdə birini vəsiyyət etsə, vərəsə həmin üçdə birdən pay götürmür. Vəsiyyət etmədiyi halda bütün mal varisindir. Böyük vərəsə meyitin dəfn və hüzür məclisinin xərcini öz payından ödəyə bilər. Kiçik vərəsənin payından xərcləmək olmaz. Böyük vərəsə də razı olmasa, onun payına toxunulmamalıdır.

Məsələ 167: İnsan vəsiyyət etməmiş ölərsə, üçdə bir ayrılmır.

Məsələ 168: Meyitin öz zövcəsinə verməli olduğu mehriyyə, bank borcu və insanlara borc kimi verəcəkləri əsil maldan çıxılır.

Məsələ 169: Bə`zi kəndlərdə qıza cehiz verilir deyə, irs payı ayrılmır. Bu kimi rəftarlar düzgün deyil, qız da, oğlan da irsdən pay alır.

Məsələ 170: İnsan vəsiyyət etməklə öz varisini irsdən məhrum edə bilməz. Ölənin canişini bu qəbildən olan vəsiyyətə əməl etməməlidir. Bəli, insan öz mülkünün üçdə birini istədiyi yönümdə vəsiyyət edə

bilər. Qalan hissə Allah kitabı və peyğəmbər sünnəsi əsasında varislər arasında bölüşdürülür.

Məsələ 171: Varisi olmayanın mülkü öldükdən sonra mə`sum imamın ixtiyarına verilir. İmam qeybdə olduğu dövrdə bu irs təqlid olunan müctəhidə təqdim edilir.

Məsələ 172: Əgər insan sağ olduğu vaxt öz mülkünün xümsünü vermişsə, öldükdən sonra ondan qalan irsə xüms düşmür. Əgər mülk sahibi sağ ikən xüms verməmişsə, öldükdən sonra irs bölünməmişdən malın xümsü verilməlidir.

Məsələ 173: İnsana gözləmədiyi ünvandan irs çatdıqda onun xümsü verilir. Məsələn, bir şəxsin xarici bir məmləkətdə əmisi ölmüşsə və o, əmisi olduğundan xəbərsiz olmuşsa, əldə etdiyi irsin xümsünü verməlidir.

## *QUR`ANDA İRS MƏSƏLƏSİ*

Qur`ani- məciddə "fəraiz" sayılan altı paydan danışılır: ikidə bir, dörddə bir, səkkizdə bir, altıda bir, üçdə bir, üçdə iki.

İkidə bir, yə`ni yarı pay üç zümrəyə aiddir: yeganə qız[1]; zövcənin övlad və nəvəsi olmadıqda ər[2]; ata-anadan və ya atadanbir yeganə bacı.[3]

Dörddə bir pay iki zümrəyə aiddir: ölmüş zövcəsinin övlad və ya nəvəsi olan ər (övlad və nəvə

[1] surə 4, ayə 11
[2] surə 4, ayə 12
[3] surə 4, ayə 176

başqa kişidən də olsa)[1]; ölmüş ərinin övlad və nəvəsi olan zövcə (övlad və nəvə başqa zövcədən olsa da).[2]

Səkkizdə bir pay bir zümrəyə aiddir: başqa bir qadından olsa belə, övladları olan kişinin zövcəsi; bir neçə zövcə olarsa, irs onlar arasında bölünər.[3]

Altıda bir pay üç zümrəyə aiddir: meyitin övlad və nəvəsi olsa belə onun ata-anası[4]; övladları olmayan, bacıları və qardaşları olan meyitin anası[5]; anadanbir yeganə bacı və qardaş.[6]

Üçdə bir pay iki zümrəyə aiddir: maneə olmadıqda meyitin anası[7]; anadanbir iki və ya daha artıq bacı və ya qardaş; onlar üçdə bir payı öz aralarında bərabər bölürlər.

Üçdə iki pay iki zümrəyə aiddir: meyitin oğlu olmadıqda iki və ya ikidən artıq qız[8]; ata-anadanbir iki və ya daha artıq bacı; ata-anadanbir bacılar olmadıqda (və meyitin ata-anadanbir qardaşı yoxsa) atadanbir bacılar.[9]

---

[1] surə 4, ayə 11
[2] surə 4, ayə 12
[3] surə 4, ayə 12
[4] surə 4, ay 11
[5] surə 4, ayə 11
[6] surə 4, ayə 12
[7] surə 4, ayə 11
[8] surə 4, ayə 11
[9] surə 4, ayə 176

# İKİNCİ RİSALƏ

## *Məhrəm və naməhrəmlik məsələləri*

### *MƏHRƏM VƏ NAMƏHRƏM*

*Rəhman və Rəhim Allahın adı ilə*

Həmd olsun müəyyən məsləhətlərə görə bə`zi qadınları bə`zi kişilərə məhrəm və onlarla izdivacı haram, bə`zi qadınları bə`zi kişilərə naməhrəm və onlarla izdivacı halal buyuran Allaha! Bir müddət idi ki, məhrəm və naməhrəm mövzusunda müxtəsər bir risalə yazmaq istəyirdim. Şükürlər olsun Allaha ki, bu mövzuda otuzadək məsələdən ibarət risalə yazmaq tövfiqini nəsib etdi.

Məhrəm və naməhrəm mövzusunda məsələləri bəyan etməzdən öncə bu mövzuda bir neçə hədisi xatırlayaq:

**1-ci hədis:** Həzrət Peyğəmbər (s) buyurmuşdur: *"(Naməhrəmə) baxmaq şeytanın zəhərli oxlarından biridir.Kim (naməhrəmə) baxmasa, Allah ona ilahi xof səbəbindən bir iman əta edər ki, qəlbində onun şirinliyini duyar."* [1]

**2-ci hədis:** Həzrət Peyğəmbər (s) buyurmuşdur: *"Kim gözünü haramla doldursa, Allah Qiyamət günü onun gözünü odla doldurar. Yalnız tövbə edən istisnadır."*[2]

**3-cü hədis:** Həzrət Peyğəmbər (s) buyurmuşdur: *"Hər kəs naməhrəm qadınla əl görüşsə, Allahın qəzəbinə üz tutmuşdur. Hər kəs naməhrəm qadınla rabitəyə qatılsa, od sırasında şeytana yaxınlaşar və hər ikisi oda atılar."* [3]

---

[1] "Biharul-ənvar", c.104, s.38, hədis 34
[2] "Biharul-ənvar", c.104, s.32, hədis 3
[3] "Biharul-ənvar", c.104, s.32, hədis 4

**4-cü hədis:** Həzrət Peyğəmbər (s) buyurmuşdur: *“Qiyamət günü yalnız üç göz ağlamaz: Allah qorxusundan ağlayan göz, Allahın haram buyurduqlarına yumulan göz, gecəni sübhədək Allah yolunda oyaq qalan göz.”* [1]

**5-ci hədis:** İmam Sadiq (ə) buyurmuşdur: *“Naməhrəm qadını görüb gözünü səmaya qaldıran və ya yuman kəs gözünü dolandıranadək izzət və cəlal sahibi olan Allah ona hurul-eynlə izdivac buyurar.”* [2]

**6-cı hədis:** İmam Kazim (ə) cəddi həzrət Əlidən (ə) belə nəql edir: *“Kor bir şəxs həzrət Fatimədən (s.ə.) otağa daxil olmaq üçün icazə istədi. Xanım Zəhra (s.ə.) pərdə arxasına keçdi. Həzrət Peyğəmbər (s) soruşdu ki, kor bir şəxsə görə pərdə arxasına nə üçün keçirsən? Xanım ərz etdi ki, o da məni görməsə, mən onu görürəm və o mənim qoxumu duyur. Həzrət Peyğəmbər (s) buyurdu:” Şəhadət verirəm ki, sən mənim tənparəmsən.”* [3]

**7-ci hədis:** Həzrət Əli (ə) həzrət Peyğəmbərə belə ərz etdi: *“Ya Rəsuləllah (s), anamın otağına daxil olarkən icazə istəyimmi?” Həzrət buyurdu ki, bəli. Həzrət Əli (ə) bunun səbəbini soruşdu. Həzrət Peyğəmbər (s) buyurdu:” Ananı libassız görmək xoşdurmu?” Həzrət Əli (ə) ərz etdi:” Xeyr.” Peyğəmbər (s) buyurdu:” Elə isə icazə al.”* [4]

**8-ci hədis:** Həzrət Peyğəmbər (s) buyurmuşdur: “ *Əri varkən gözünü başqa kişilərə baxmaqla dolduran (başqalarına göz dikən) qadına Allahın qəzəbi böyükdür.”* [5]

---

[1] "Biharul-ənvar", c.104, s.35, hədis 18
[2] "Biharul-ənvar", c.104, s.37, hədis 28
[3] "Biharul-ənvar", c.104, s.38, hədis 36
[4] "Biharul-ənvar", c.104, s.38, hədis 37
[5] "Biharul-ənvar", c.104, s.39, hədis 42

**9-cu hədis:** İmam Sadiq (ə) buyurmuşdur: “*(Naməhrəmə) baxmaq şeytanın zəhərli oxlarından olan bir oxdur. (Qiyamətdə) həsrət və qəm-qüssə ilə uzanası baxış nə çox!”* [1]

**10-cu hədis:** *“Həzrət Əli (ə) qadınlara salam verirdi. Amma gənc qadınlarla salamlaşmaqdan çəkinirdi. Buyurardı ki, gənc qadınların səsinin məni həyəcanlandıracağından və günaha düşəcəyimdən qorxuram. Bunun zərəri salam verməyin mükafatından böyükdür.”* [2]

## *MƏHRƏMLİK YOLLARI*

Qadınlar üç yolla kişilərə məhrəm olur: nəsil yolu, südvermə yolu, izdivac yolu.

Nəsil yolu ilə insana məhrəm olanlar: ata və ana, baba və nənə kimi onlardan yuxarı; övlad, nəvə və nəticə kimi onlardan aşağı; bacı və qardaş, bacının və qardaşın övladı kimi onlardan aşağı; əmi və bibi, ata-ananın əmisi və bibisi kimi onlardan yuxarı; dayı və xala, ata-ananın dayısı və xalası kimi onlardan yuxarı.

Nəsil yolu ilə məhrəm olmayanlar süd yolu ilə məhrəm ola bilər. Məsələn, süd yolu ilə ata, ana, övlad, bacı, qardaş, əmi, bibi, dayı, xala; yoldaşın süd anası, süd yolu ilə atanın arvadı, süd yolu ilə oğulun arvadı.

İzdivac yolu ilə insana məhrəm olanlar: zövcənin anası və yuxarı getdikcə analar (məsələn, qaynananın anası); zövcənin qızı və aşağı getdikcə hər biri (məsələn, zövcənin qızının qızı); atanın zövcəsi, yə`ni analıq və yuxarı getdikcə hər biri (məsələn, babaların arvadları); oğulun zövcəsi, yə`ni gəlin və aşağı getdikcə hər biri (məsələn, nəvə və nəticənın zövcəsi).

---

[1] "Biharul-ənvar", c.104, s.40, hədis 46

[2] "Biharul-ənvar", c.104, s.37, hədis 26

## Məhrəm və naməhrəmlik

Bə`ziləri isə insana məhrəm olsalar da, onlarla izdivac (evlənmək) haramdır. Məsələn, insanın (Allah eləməmiş) zina etdiyi qadının qızı; insanın (Allah eləməmiş) livat, həmcinsbazlıq etdiyi kişinin bacısı, anası və qızı. Bu mövzu 30-cu məsələdə ətraflı şəkildə açıqlanacaq. Əlbəttə ki, məhrəmlik və naməhrəmlik mövzusunda bə`zi nöqtələr nəzərdən qaçırıla bilər, bəzilərinin isə təkrarlanması mümkündür.

Məsələ 1: Ata və ana xətti nə qədər yuxarı qalxsa da, (məsələn, baba və nənə) insana məhrəmdir.

Məsələ 2: Övlad və bu xəttin aşağıya davamı (məsələn, nəvə və nəticə) insana məhrəmdir.

Məsələ 3: Bacı və qardaş bir-birinə məhrəmdir. Eləcə də qardaşın övladı bacıya, bacının övladı qardaşa məhrəmdir.

İzahat: Bir-birinə məhrəm olan bacı və qardaşlar üç qisimdir: Ata-anaları eyni olan ata-anadanbir bacı və qardaş birinci qismə aiddir. İkinci qismi ataları bir olan atadanbir bacı və qardaşlar təşkil edir. Yalnız anaları bir olan anadanbir bacı və qardaşlar üçüncü qismə aiddir.

Amma bir kişi ilə bir qadın evləndikdə kişinin əvvəlki arvadından olan oğul və qızları qadının əvvəlki ərindən olan oğul və qızlarına məhrəm olmur. Çünki onların nə ataları, nə də anaları eynidir. Amma qadının ərindən övladı olarsa, bu övlad kişinin əvvəlki zövcədən olan övladına məhrəmdir. Çünki onların ataları eynidir.

Məsələ 4: Bibi və əmi insana məhrəmdir. İnsanın ata və anasının bibi və əmisi də ona məhrəm sayılır.

**İzahat:** İnsana məhrəm olan bibi və əmi üç qisimdir: birinci qismi ata-anası insanın atasının ata-anası ilə eyni olan ata-anadanbir əmi və bibilər təşkil edir. Yalnız atası insanın atası ilə eyni olan atadanbir əmi və bibilər ikinci qismə aiddir. Yalnız anası insanın

atasının anası ilə eyni olan anadanbir bibi və əmilər üçüncü qisimdən sayılır.

Amma anadanbir qardaş və bacının əmi və bibisi insana məhrəm deyil. Çünki onların əmi və bibisi insana əmi və bibi sayılmır.

**İzahat:** İki dəfə ərə getmiş və hər bir ərindən övladları olan qadının birinci ərindən olan övladının əmi və bibisi ikinci ərindən olan övladının əmi və bibisi ilə eyni deyil. Deməli, birinci ərdən olan övladın əmi və bibisi ikinci ərdən olan övlada, ikinci ərdən olan övladın əmi və bibisi birinci ərdən olan övlada məhrəm deyil.

Məsələ 5: Dayı və xala insana məhrəmdir. İnsanın ata və anasının dayı və xalası da ona məhrəmdir.

**İzahat:** İnsana məhrəm olan dayı və xala üç qisimdir: ata-anası insanın anasının ata-anası ilə eyni olan ata-anadanbir dayı və xala; atası insanın anasının atası ilə eyni olan atadanbir dayı və xala; anası insanın anasının anası ilə eyni olan anadanbir dayı və xala.

Amma atadanbir qardaş və bacının dayı və xalası insana məhrəm deyil. Çünki onların dayı və xalası insana dayı və xala sayılmır.

**İzahat:** İki arvad almış və hər birindən övladı olan kişinin birinci arvaddan olan övladının dayı və xalası ikinci arvaddan olan övladının dayı və xalası ilə eyni sayılmır. Belə ki, birinci arvaddan olan övladın dayı və xalası ikinci arvaddan olana, ikinci arvaddan olan övladın dayı və xalası birinci arvaddan olan övlada məhrəm deyil.

Məsələ 6: Ata-ana, övlad, bacı-qardaş, əmi və bibi, dayı və xala haqqında deyilən məsələlər həm nəsil, həm də süd yolu ilə məhrəmliyə aiddir. Yə`ni ana, bacı, bibi və xala nəsil yolu ilə insana məhrəm olduğu kimi, süd yolu ilə də ana məhrəm ola bilər. Ata, oğul, qardaş, əmi

və dayı nəsil yolu ilə insana məhrəm olduğu kimi, süd yolu ilə də məhrəm sayılır.

**İzahat:** Süd yolu ilə məhrəmliyin tə`mini üçün risalələrdə yazılmış şərtlər tə`min olunmalıdır.

**Məhrəm olmağa səbəb olan südvermənin 9 şərti var:**

1-Uşaq diri qadının döşündən süd əmsin; Deməli ölmüş qadının döşündən süd əmsə, faydası yoxdur (məhrəmlik yaratmır).

2-O qadının südü haramdan olmasın; Deməli zinadan dünyaya gələn uşağın südünü başqa uşağa versələr uşaq o süd vasitəsilə heç kəsə məhrəm olmur.

3-Süd doğumdan olsun; Deməli uşaq doğulmamışdan qadının döşündən süd gəlsə və bir uşaq o südü əmsə, məhrəmliyə səbəb olmur.

4-Uşaq südü qadının döşündən əmsin; Deməli südü uşağın boğazına töksələr, məhrəmliyə səbəb olmur.

5-Süd xalis olub başqa şeylərlə qarışmasın;

6-Süd bir ərdən olsun; Deməli süd verən qadına təlaq versələr sonradan başqa ərə gedib ondan hamilə olsa, doğuş vaxtına qədər döşündə birinci ərindən süd qalsa və ya misal üçün, 8 dəfə doğuşdan qabaq birinci ərinə məxsus olan süddən və doğandan sonra isə 7 dəfə ikinci ərinə məxsus olan süddən uşağa versələr, o uşaq heç kəsə məhrəm olmur.

7-Uşaq xəstəlik səbəbilə əmdiyi südü qaytarmasın. Əgər qaytararsa ehtiyat-vacibə görə gərək süd əmmək vasitəsilə o uşağa məhrəm olacaq kəslər onunla evlənməsinlər və məhrəm baxışlarla baxmasınlar.

8-15 dəfə, yaxud bir gün (24 saat) ərzində, sonrakı məsələdə deyiləcəyi kimi doyunca süd əmsin, yaxud onu o qədər əmizdirsinlər ki, “o südlə sümüyü möhkəmlənmişdir, bədənində ət əmələ gəlmişdir”

desinlər. Hətta əgər 10 dəfə də ona süd versələr və onların arasında heç fasilə (hətta yemək verilməklə də) düşməsə, ehtiyat-vacib budur ki, ona süd vasitəsilə məhrəm olan kəslər onunla evlənməsinlər, ona məhrəm baxışlarla baxmasınlar.

9-Uşağın iki yaşı tamam olmamış olsun; Deməli, iki yaşı tamam olandan sonra ona süd versələr, heç kəsə məhrəm olmur. Hətta əgər misal üçün, iki il tamam olmamışdan qabaq 8 dəfə, tamam olandan sonra isə 7 dəfə süd əmsə heç kəsə məhrəm olmur. Amma əgər süd verən qadının doğuşundan iki ildən artıq keçmiş olsa və onun südü hələ də qalmış olsa, bir uşağa süd versə, ehtiyat-vacib budur ki, onunla evlənməyi, məhrəmiyyət rəftarını tərk etsinlər.

Məsələ 7: Əminin, bibinin, dayının, xalanın qızı insana məhrəm deyil. Eyni qaydada, əminin, bibinin, dayının, xalanın oğlu insana məhrəm olmur.

Məsələ 8: Əminin zövcəsi həm də xaladırsa, insana məhrəmdir. Dayının zövcəsi həm də bibidirsə, insana məhrəmdir. Əks təqdirdə, nə əminin və dayının zövcəsi, nə də bibinin və xalanın əri insana məhrəm olmur.

Məsələ 9: Əminin və ya dayının zövcəsi insanın qaynanası olarsa, məhrəmdir. (Yə`ni insan öz əmisi və ya dayısı qızı ilə evlənərsə, əmisinin və ya dayısının zövcəsi ona məhrəm olar).

Məsələ 10: İnsanın atasının zövcəsi, atasının atasının zövcəsi, anasının atasının zövcəsi insana məhrəmdir və ömrün sonunadək onlarla izdivac haramdır.

Amma insanın zövcəsinin atasının zövcəsi insana məhrəm sayılmır və qaynana hökmündə deyil.

Məsələ 11: İnsanın gəlini (oğlunun zövcəsi), oğulun gəlini (nəvənin zövcəsi), qızın gəlini (qız nəvəsinin zövcəsi) insana məhrəmdir.

Amma insanın zövcəsinin gəlini (zövcənin oğlunun zövcəsi) insana məhrəm deyil.

Məsələ 12: Öncəki məsələdən əks halın da hökmü mə`lum olur. Yə`ni qadının ərinin atasının atası insana məhrəmdir. Eyni qaydada, ərin anasının atası insana məhrəm olur.

Məsələ 13: İnsanın yeznəsi (qızının əri), oğulun yeznəsi (oğulun qızının əri), qızın yeznəsi (qızın qızının əri) insana məhrəmdir.

Amma ərin yeznəsi (ərin qızının əri) insana məhrəm deyil.

Məsələ 14: İnsanın qaynanası insana məhrəmdir. Burada həm nəsil, həm də süd yolu ilə ana nəzərdə tutulur. Zövcənin anasının anası və yuxarı getdikcə hər bir ana bu hökmdədir.

Məsələ 15: Ərin övladı, ərin oğul və qız nəvələri insana məhrəmdir.

Məsələ 16: Zövcənin (arada yaxınlıq olmuşsa) övladı, onun oğul və qız nəvələri insana məhrəmdir. Bu övlad həm əvvəlki, həm də ki, sonrakı ərdən ola bilər.

Amma arada yaxınlıq baş verməmişsə övlad məhrəm sayılmır.

Məsələ 17: İnsanın zövcəsinin bacısı insana məhrəm deyil. Amma onunla izdivac da etmək olmaz. Yalnız zövcə dünyasını dəyişdikdən və ya ona təlaq verildikdən sonra iddə müddəti başa çatarsa, öncəki zövcəsinin bacısı ilə evlənə bilər.

Məsələ 18: İnsanın zövcəsinin qardaşı övladları, bacısı övladları (zövcə onların bibisi və ya xalasıdır) insana məhrəm deyil. Amma zövcədən, yə`ni onların bibisi və ya xalasından icazəsiz onlarla evlənmək olmaz.

Məsələ 19: İnsanın zövcəsinin atasının anası insana məhrəmdir. Çünki insan həmin qadının yeznəsi sayılır.

Oğulun, qızın, insanın özünün yeznəsi insana məhrəmdir.

Məsələ 20: İnsana öz gəlini məhrəm olduğu kimi, onun oğlunun, qızının, oğul və qızdan olan nəvələrinin gəlini də məhrəmdir.

İnsanın zövcəsinin gəlini insana məhrəm deyil. Yə`ni zövcənin əvvəlki ərindən oğulu və gəlini varsa, oğulunun zövcəsi ananın ərinə məhrəm deyil.

Məsələ 21: Kişiyə məhrəm olan qadınlardan biri də zövcənin qızıdır. İstər əvvəlki, istərsə də sonrakı ərdən olan qız məhrəmdir. Əgər zövcə boşanıb, yenidən ərə getsə və qızı olsa, həmin qız əvvəlki ərə məhrəmdir. Eləcə də, insanın zövcəsinin oğlunun qızı insana məhrəm sayılır.

Əlbəttə ki, yalnız zövcə ilə yaxınlıqdan sonra bu qız məhrəm olur.

Məsələ 22: İnsanın zövcəsinin qohumları (onun anası, anasının anası, atasının atası və ərinin qızı istisna olmaqla) insana məhrəm deyil. Beləcə, zövcənin bacısı, bibisi, xalası, qardaşının zövcəsi, qardaşının övladları, bacısının övladları, əmisinin övladları, bibisinin övladları insana məhrəm deyil. Zövcənin atasının zövcəsi insana məhrəm sayılmır. Yə`ni zövcənin atasının zövcəsi qaynana hökmündə deyil. Atanın zövcəsi deyə bilməz ki, bu şəxs mənim yeznəmdir. Çünki həmin şəxs onun yox, onun ərinin yeznəsidir.

Digər bir məsələ budur ki, insanın atasının zövcəsinin anası insana məhrəm deyil. Yə`ni atanın yeni zövcəsinin anası məhrəm sayılmır. Atanın zövcəsi isə məhrəmdir.

Məsələ 23: Əgər qadın bir oğlan və ya qıza risalələrdə qeyd olunmuş şərtlər ödənməklə süd verərsə, onların süd anası olar. Həmin qadının əri körpələrə süd atası, övladları süd bacı-qardaşı, bacı və qardaşı süd

xalası və dayısı, ərinin bacı və qardaşı süd bibisi və əmisi sayılar. Onların hər biri qadının süd verdiyi oğlan və qıza məhrəmdir. Bir sözlə, nəsil yolu ilə məhrəm olanlar, süd yolu ilə də məhrəm olur. Məsələn, süd atası nəsil atası, süd anası nəsil anası, süd bacı-qardaşı nəsil bacı-qardaşı kimidir.

Süd yolu ilə məhrəmlik yaransa da, bu əlaqə insanın irs sahibi olması üçün kifayət etmir. Məsələn, süd övladı süd atası və süd anasından irs almır.

Məsələ 24: Bə`zən süd vermək ər və arvadı bir-birinə əbədi haram edir. Bu halda boşanmaqdan başqa yol qalmır. Məsələn, bir şəxs südəmər körpəni atasının icazəsi ilə özünə əqd etsə və onun əqdində olan başqa bir qadın bu uşağa süd versə, hər iki zövcə ərə əbədi haram olar. Çünki böyük zövcə süd zövcəsinin anası olur, kiçik zövcə böyük zövcənin süd qızı.

Məsələ 25: Əgər qadın yeznəsinin südəmər körpəsinə və ya ərinin yeznəsinin südəmər körpəsinə şərtlər ödənməklə süd verərsə, qızı yeznəsinə və ya ərinin yeznəsinə əbədi haram olur. Rəvayətdə bildirilir ki, südəmər körpənin atası süd verən qadının övladı ilə evlənməməlidir. O süd verən qadının süd sahibi olan kişinin övladı ilə də evlənə bilməz. Zikr olunan məsələdə yeznənin arvadı ya süd sahibinin övladıdır, ya süd verən qadının övladı. O hər iksinin övladı da ola bilər. Bu halda onların izdivacı batildir.

Məsələ 26: Əgər kişi başqasına məxsus olan qızın ona məhrəm olmasını istəyərsə, qardaşı arvadının və ya bacısının həmin qıza süd verməsi kifayətdir. Bu halda kişi həmin qızın ya süd əmisi, ya da süd dayısı olur. Əgər bir qadın başqasına məxsus oğlanın ona məhrəm olmasını istəyərsə, qardaşı arvadının və ya bacısının həmin oğlana süd verməsi kifayət edər. Bu halda qadın həmin oğlanın süd bibisi və ya süd xalası olur.

**İkinci risalə**

Məsələ 27: Əgər bir şəxs (Allah eləməmiş) bir qadınla zina edərsə, həmin qadının anası və ya qızı ilə evlənə bilməz. Həmin qadın ərdə olmazsa, onunla izdivacın eybi yoxdur.

İnsan bir qadınla evləndikdən sonra həmin qadının anası və ya qızı ilə (Allah eləməmiş) zina edərsə, həmin qadın ona haram olar.

Məsələ 28: Əgər bir şəxs (Allah eləməmiş) ərli qadınla zina edərsə, həmin qadın ona əbədi haram olar. Yə`ni həmin qadının əri ölsə və ya onu boşasa belə, zina edən şəxs onunla evlənə bilməz.

Məsələ 29: Əgər bir şəxs (Allah eləməmiş) bir oğlanla həmcinsbazlıq (livat) edərsə, onun anası, bacısı və ya qızı ilə evlənə biməz. Yə`ni həmin qadınlar ona əbədi haramdır. Əgər bir qadınla izdivacdan sonra onun oğlu, qardaşı və ya atası ilə (Allah eləməmiş) livat edərsə, həmin qadın ona əbədi haram olar.

Məsələ 30: İddədə olan qadınla izdivac bir neçə şəkildə baş verə bilər:

1.Hər iki tərəf qadının iddədə olduğunu və iddəli qadınla evlənməyə icazə verilmədiyini bilir;

2.Tərəflərdən biri məsələdən xəbərdardır; bu iki halda izdivac baş verərsə batildir və qadınla kişi bir-birinə əbədi haramdır.

3.Qadının iddədə olmasından və iddəli qadınla izdivaca yol verilməməsindən hər iki tərəf xəbərsizdir; yalnız yaxınlıqdan sonra mə`lum olur ki, qadın iddədədir və iddəli qadınla izdivaca icazə verilmir. Bu halda da izdivac batildir və hər iki tərəf bir-birinə əbədi haramdır.

4.Hər iki tərəf məsələdən xəbərsizdir və yaxınlıqdan öncə məsələdən xəbər tutur; bu halda onlar bir-birlərinə əbədi haram olmurlar. Amma oxunmuş əqd

batildir və tərəflər iddə tamam olanadək səbr etməlidir. İddə başa çatdıqdan sonra tərəflər evlənə bilər.

Dördüncü halda həm qadının iddədə olmasından, həm də iddəli qadınla izdivaca yol verilməməsindən xəbərsiz olmaq zəruri deyil.

Əgər bu iki haldan birindən xəbərsizdirlərsə, məsələn, yalnız qadının iddəli olması bilinir, ya da iddəli qadınla evlənmənin mümkünsüzlüyü mə`lum olur.

## ÜÇÜNCÜ RİSALƏ

## *Böyük (kəbirə) günahlar*

### *BÖYÜK GÜNAHLAR*

Bəşəriyyətin dünya və axirət səadəti üçün peyğəmbərlər göndərən, onlar vasitəsi ilə böyük günahları bəyan edən, günahlara yol verənləri cəhənnəm əzabı ilə qorxudan Allaha həmd olsun! Bu yolla insanlar günahdan çəkinər və nəticədə əbədi axirət səadətinə çatarlar. Allahın ən üstün məxluqu olan həzrət Məhəmməd (s) ibn Abdullaha və onun ailəsinə sonsuz salam!

Mö`minlərin istəyi ilə 1995-ci ildə böyük günahlar haqqında araşdırılma aparıldı. Ümid edirik ki, mö`min qardaşlar bu risaləni mütaliə edəcək. Əgər kitabda qeyd olunmuş günahlardan birinə yol vermişlərsə, bu günahı tərk etmək üçün Allahdan tövfiq istəsinlər və inşaəllah nicat tapsınlar.

Kitabın mətnləri beş fəsildə və bir sonluqda verilmişdir.

Birinci fəsildə kəbirə günahlarla bağlı Qur`an ayələri və onların tərcüməsi verilir.

İkinci fəsildə bir sıra kəbirə günahların nəql olunduğu rəvayətlər və fəqih bəyanatları əks olunur.

Üçüncü fəsildə kəbirə günahların müəyyənləşdirilməsi yolları tanıtdırılır.

Dördüncü fəsildə alimlər və fəqihlərin hansı günahları kəbirə günah sayması bildirilir.

Beşinci fəsildə bildirilir ki, kəbirə və səğirə günahlara yol verənlərin peyğəmbərə canişinlik ləyaqəti yoxdur. Xilafət və imamət yalnız kəbirə və səğirə günahdan ömür boyu çəkinənlərin haqqıdır. Bəyan olunur ki, həzrət Peyğəmbərdən sonra belə bir məqam

(günahdan uzaqlıq) yalnız müttəqilər mövlası Əmirəl-mö`minin və onun on bir övladına aiddir. Qeyd olunur ki, şiələrin əqidəsinə əsasən mə`sum imam Allah tərəfindən peyğəmbər vasitəsi ilə tanıtdırılır. Xalq mə`sumu tanımaq gücündə olmadığından onu müəyyənləşdirmək imkanında deyil. Sünnilərin belə bir əqidəsi düzgün deyil.

Sonluqda ədalət məfhumu açıqlanır, ədalətli kəsin kimliyi bəyan olunur. Ədalətli şəxs o kəsdir ki, onda kəbirə günahların qarşısını alacaq iman qüvvəsi var. Belə bir şəxs kiçik günahları da davam etdirmir.

Əlinizdəki risalə də beş fəsil və bir sonluqdan ibarətdir. Birinci fəsildə kəbirə günahların rəvayətlərdə qeyd olunmuş tə`sirləri bəyan olunur. İkinci fəsildə günah əhli ilə oturub-duranlar məzəmmət edilir. Üçüncü fəsildə günahlarını e`tiraf edənlər mədh olunur. Dördüncü fəsildə tövbə və onun şərtləri qeyd edilir. Beşinci fəsildə günahdan tövbə ilə bağlı rəvayətlər nəql olunur və tövbənin faydaları sadalanır. Sonluqda "Nəhcül-bəlağə"dən günah və tövbə ilə bağlı bir xütbənin tərcüməsi verilir.

## *Birinci fəsil:*

## *KƏBİRƏ GÜNAHLAR HAQQINDA AYƏLƏR VƏ ONLARIN TƏRCÜMƏSİ*

Qur`ani-məciddə kəbirə günahlardan çəkinənləri mədh edən və onları müjdələyən ayələr mövcuddur.

**Birinci ayə:** *"Əgər qadağa qoyulmuş böyük günahlardan çəkinib onları tərk etsəniz sizin kiçik günahlarınızı örtər, sizi pak və çox gözəl bir məkana daxil edərik. Orada heç bir nöqsan yoxdur və ora behiştdir."* [1]

---

[1] "Nisa", 31

**Üçüncü risalə**

Səğirə (kiçik) günahın olmamasını düşünən alimlər ayəni belə mə`nalandırır:” Bu və bundan başqa surələrdə bəyan olunmuş böyük günahlardan çəkinsəniz, əlbəttə, biz sizin keçmiş günahlarınızı bağışlayarıq.” Yə`ni sizin hazırda bu günahları tərk etməyiniz keçmiş günahlarınızın kəffarəsidir.

**İkinci ayə:** *“Sizə düyada verdiyimiz ailə, övlad və sərvət kimi şeylər dünya matahıdır, ölüm vaxtı hər biri sizdən ayrılasıdır. Behişt və behiştdə olan ne`mətlər kimi Allahın yanında olan axirət ne`mətləri imanlı, yalnız Allaha təvəkkül edən, böyük günahlardan və pis işlərdən çəkinənlər, zülmü bağışlayıb əvəzini çıxmayanlar üçün daha üstündür.”*[1]

**Üçüncü ayə:** *“Göylərdə və yerdə nə varsa Allaha məxsusdur.”*[2]

“Nəcm” surəsinin bu ayədən öncəki ayəsində Allah-təala öz elminin nəhayətsizliyini bəyan edir. Bu ayədə bəyan olunur ki, hər bir şəxsi əməllərinə görə cəzalandırıb günahkarları cəhənnəmə daxil etməsi bu nəhayətsiz elmin nəticələrindəndir. Allah həm də yaxşı iş görənlərə mükafat verir. Yaxşı iş görənlər isə böyük günahlardan və çirkin işlərdən çəkinənlərdir.

Saleh əməl sahibləri ismət məqamında olmadığından onlardan kiçik günahlar baş verə bilər. Amma onlar kiçik günahları təkrarlamırlar. Çünki kiçik günahların təkrarı özü böyük günahdır. Allah-təala bu ayədə kiçik günahları istisna etmişdir. Bildirilir ki, yalnız təkrarlanmayan kiçik günahlar bağışlanasıdır.

Böyük günaha yol verməyənin kiçik günahı bağışlanır. Allah-təala buyurur ki, Allahın mərhəməti böyükdür.

---

[1] "Şura", 36, 37

[2] "Nəcm", 31, 32

Bə`ziləri daim özünü tə`rif etdiyindən Allah-təala buyurur ki, Rəbbiniz sizi daha yaxşı tanıyır və özünüzü tə`rif etməyin. Allah təqvalı olub kəbirə günahlardan çəkinənlərdən daha yaxşı xəbərdardır.

Müəllif deyir: Əgər bir şəxs özünü saxlayıb, tə`rifdən çəkinsə, ibadətdə riyadan uzaq olar, daha səmimi ibadət edər. Allah ona xatir yaxşılığa üz tutanların yaxşılığını zahirə çıxardır, məhəbbətini qəlblərə salır. Deməmk, insanın özünü tə`rif etməsinə ehtiyac yoxdur.

*Çalış müşkü qoxusundan tanı sən,*
*Müşk tanınmır əttarın tə`rifindən.*

Allah-təala Qur`ani-kərimdə buyurur: "Həqiqətən, Allah Onun birliyinə, peyğəmbərin risalətinə, məada inanıb, saleh, Onun razılığına uyğun işlər görənlərin məhəbbətini qəlblərə salar."[1]

## *İkinci fəsil:*

## *RƏVAYƏTLƏRDƏ VƏ FƏQİHLƏRİN BƏYANATLARINDA KƏBİRƏ GÜNAHLARIN SAYI*

Rəvayətlərdə və alimlərin buyuruqlarında müxtəlif saylı kəbirə günahlar qeyd olunur. Bə`zi alimlər yetmiş yeddi, bə`ziləri yetmiş, bə`ziləri altımış, bə`ziləri qırx, bə`ziləri iyirmi, bəziləri yeddi kəbirə günah olduğunu bildirir. Hədislərdə kəbirə günahların otuz iki, iyirmi bir, yeddi, beş olduğu da qeyd edilir.

**Birinci rəvayət:** İmam Riza (ə) Mə`mun Ər-Rəşidə yazır: "*İmanın xalislik əlaməti budur ki, mö`min böyük günahlardan çəkinsin.*" Sonra buyurur: "*Kəbirə*

[1] "Məryəm", 96

*günahlar bunlardır: Günahsızı öldürmək, zina, oğurluq, şərabxorluq, ata-ananı incitmək, İslam uğrunda savaşdan qaçmaq, yetimin malını zorla yemək, ölmüş heyvanın ətini yemək, qan içmək, donuz əti yemək, bütlərin adına kəsilmiş heyvanın ətindən yemək, haram olduğunu bilib sələm yemək, rüşvətxorluq, udub-uduzmaqla müşayiət olunan qumar, ölçüdə və çəkidə əskiltmək, pak qadını zinakarlıqda suçlamaq, livat (həmcinsbazlıq), haqsız yerə şəhadət, axirət rahatlığına ümidsizlik, özünü Allahın əzabından amanda bilmək, Allahın mərhəmətindən ümidsizlik, zalıma kömək və onlara meyl etmək, yalandan and içmək, güc çatan halda borcu ödəməyib haqqı saxlamaq, yalan, təkəbbür, israf (malı boş yerə və ya haram yolda sərf etmək), xəyanət, Həcdən boyun qaçırmaq (güc çatan halda Həccə getməmək, Həcci kiçik saymaq), Allah dostları ilə savaş, şər`ən bəyənilməyən boş işlərə məşğulluq, kiçik günahı davam etdirmək (naməhrəmə baxmaq kiçik günah olarsa, çox baxmaq).”*[1]

**İkinci rəvayət:** İmam Sadiq (ə) buyurur: *“Əli ibn Əbi-Talibin (ə) yazısında beş böyük günahla rastlaşdım: Allah-təalaya qarşı şirk, ağvalideynlik, sələm yemək, İslam savaşından qaçmaq, dini məsələləri öyrənmək şəraiti olan şəhərdən dini məsələlərin yada salınmadığı yerə köçmək.”*[2]

Bu çox incə məsələdir. Bir çox e`tiqadlı insanlar tanıyıram ki, dindar, məscidi olan məhəlləni qoyub, Tehranın dini mühiti olmayan yerinə köçüblər. Həmin yerdə onların nəinki dini mə`lumat əldə etmək imkanı yoxdur, hətta qonşuları qeyri-müsəlmandır. Məhz bu səbəbdən belələrinin övladları dindən uzaq düşür,

---

[1] Şeyx Mürtəza Ənsari, "Məkasib", s.333, 334
[2] Şeyx Səduq, "Xisal", s.273

oğlanları büdrəyir, qızları hicaba riayət etmir. Dini göstərişləri nəzərə almadan  mənzili və yeri dəyişmək belə nəticələnir.

*Ağlının, dininin artması üçün*
*Yoldaşın olmalı özündən üstün.*

Əziz oxucular təqlid etdikləri müctəhidlərdən soruşa bilər ki, müsəlman ölkəyə hicrətdən sonra kafir ölkəyə qayıtmaq kəbirə günahdırsa, müsəlman məhəlləsindən qeyri-müsəlman məhəlləsinə köçmək hansı hökmdədir? Məzhəbi bir yerdən qeyri-məzhəbi şəhərə köçmək də günahdır, yoxsa yox?

*Üçüncü rəvayət:* Ravi nəql edir ki, İmam Sadiqdən (ə) kəbirə günah haqqında soruşdum və o belə cavab verdi: *"Kəbirə günah beşdir və onlar elə günahlardır ki, Allah-təala onların müqabilində cəhənnəm odu və`d etmişdir:*

*1. Yetimin malını zorla yemək; Allah-təala izzət və cəlalına and içir ki, yetimin malını zorla yeyənlərə od yedirəsidir. Beləəri tezliklə cəhənnəm oduna sürüklənər.*

*2. İslam savaşından qaçmaq; Allah-təala buyurur ki, ey iman gətirənlər, savaş meydanında kafirlərin çoxluğunu görüb onlara arxa çevirməyin. Yə`ni cihaddan qaçmayın. Şübhəsiz, islami savaşdan qaçanların yeri cəhənnəmdir.*

*3. Sələmçilk; həzrət sələmin haram olmasından danışarkən belə bir ayəni dəlil göstərir:" Ey iman gətirənlər, Allahdan çəkinin, günaha yol verməyin, sələm yeməyin, sələmin artığını almayın." Yə`ni əgər mö`minsinizsə, verdiyiniz puldan mənfəət götürməyin.*

*4. Pak qadını zinada suçlamaq.*

*5. Mö`mini mö`min olduğu üçün bilərəkdən öldürmək."*

**Üçüncü risalə**

**Dördüncü rəvayət:** *"İmam Sadiq (ə) buyurur ki, yeddi böyük günah var və bu günahlara bizə hörmətsizlikdən yol verilir: Allah-təalaya münasibətdə şirk; Allahın möhtərəm saydığını öldürmək; yetimin malını zorla yemək; ata-ananın haqqına riayət etməmək; pak qadınları zinada suçlamaq; İslamı cihaddan qaçmaq; biz peyğəmbər ailəsindən olan əhli-beytin haqlarının inkarı."*

Allaha münasibətdə şirklə bağlı deyə bilərik ki, Allah biz Əhli-beyt (ə) haqqında ayə göndərmiş, həzrət Peyğəmbər (s) bizim haqqımızda tövsiyələr vermişdir. Səqəleyn hədisi buna misal ola bilər. İnsanlar Allah və onun rəsulunu inkar etdilər, bizim haqqımızı tapdadılar. Beləcə, Allaha qarşı şirkə yol verdilər.

Mömինin qətlə yetirilməsi ilə bağlı deyə bilərik ki, zalımlar imam Hüseyni (ə) və onun köməkçilərini qətlə yetirdilər.

Yetimin malının yeyilməsi ilə bağlı deyə bilərik ki, Allahın bizim üçün müəyyənləşdirdiyi xüms payını başqalarına verdilər.

Ata-anaya münasibətdə itaətsizliklə bağlı deyə bilərik ki, Allah Qur`anda peyğəmbərin insanlara onların özündən yaxın olduğunu bildirir. Peyğəmbərin zövcələri xalqa ana sayılır. Demək, həzrət Peyğəmbərə (s) qarşı itaətsizlik olunanda, həzrət Xədicənin haqları pozuldu.

İffətli qadınların günahda suçlanması ilə bağlı deyə bilrik ki, xanım Fatiməyə minbərdə mane oldular. Dedilər ki, Həsən və Hüseyn qız nəvəsi olduğundan Peyğəmbərə (s) övlad sayılmır. Onların bu sözlərdə məqsədi imamət maqamını inkar etmək idi.

İmam Həsənin şəhadətindən sonra bu qəbil təbliğatlar Bəni-Üməyyənin proqramına çevrildi. Cümə

namazlarında, dini bayramlarda yuxarıdakı məqsəd izlənilir, həzrət Fatimənin haqqı tapdanırdı.

Əslində xanım Fatimənin (s) hansısa şəkildə təhqiri nəzərdə tutulmur. Çünki xanım hətta düşmənlərin inkar edə bilməyəcəyi həddə pak və iffətli idi.

Cihad meydanından qaçmaq dedikdə həzrət Əliyə (ə) bey`ət edənlərin sonradan onu tərk etməsi nəzərdə tutulur.

Bizim haqqımızın inkarı isə aydın bir məsələdir və mübahisəyə yer yoxdur.”[1]

**Beşinci rəvayət:** Həzrət Əbdül-Əzim Həsəni buyurur: İmam Məhəmməd Təqi (ə) mənə belə nəql etdi: Atam öz atasından belə eşitdiyini buyurdu: “Əmr ibn Übeyd atam imam Sadiqin (ə) yanına gəlib salam verdi və belə bir ayə oxudu:” Böyük günahdan uzaqlaşanların, onlara qılınan zülmü bağışlayanların, əvəz çıxmaq fikrində olmayanların...” O, sözünü yarımçıq saxladı. İmam buyurdu: “Nə üçün dayandın?” O dedi: “İstəyirəm Qur`andakı böyük günahları tanıyım.” İmam buyurdu: “Ey Əmr! Ən böyük günah Allaha qarşı şirkdir. Allah-təala buyurur ki, Ona qarşı şirkə yol verənə behişt haramdır.[2] Allaha şirkdən sonra növbəti böyük günah Onun mərhəmətindən ümidi üzməkdir. Çünki Allah-təala buyurur ki, yalnız kafirlər Allahın mərhəmətindən ümidini üzür. [3]Növbəti böyük günah insanın özünü Allahın cəzasından amanda bilməsidir. Allah-təala buyurur ki, yalnız riyakarlar özünü Allahın cəzasından amanda bilir. [4] Kəbirə günahlardan biri də ata-anaya ağ olmaqdır. Çünki Allah ağvalideyni zalım kimi tanıtdırır. Allah-təala həzrət

---

[1] "Xisali-Səduq", s.364
[2] bax:"Maidə",72
[3] bax:"Yusuf",87
[4] bax: "Ə`raf",99

**Üçüncü risalə**

İsanın dilindən bəyan edir: “Allah məni anama münasibətdə xeyirxah qərar verdi və məni zalım buyurmadı.”[1] Başqa bir böyük günah Allahın möhtərəm saydığı günahsız insanı öldürməkdir. Buna qisas misal ola bilər. Allah-təala buyurur: “Hər kəs bilərəkdən mö`mini öldürsə, cəası cəhənnəmdir və orada əbədi qalar. Allah ona qəzəblənər, onu lə`nətləyər, ona böyük əzab hazırlayar.”[2] Pak qadını zinada suçlamaq növbəti böyük günahdır. Allah-təala buyurur ki, mö`minə pak qadınları günahda suçlayanlara dünya və axirətdə lə`nət olsun. Onlar üçün böyük əzab var. [3]Başqa bir kəbirə günah yetimin malını zorla yeməkdir. Allah-təala buyurur ki, yetimlərin malını zorla yeyənlər həqiqətən qarınlarını odla doldurur. Onlar şübhəsiz cəhənnəmə daxil olar, od tutub yanar. [4]Cihad meydanından qaçmaq növbəti kəbirə günahdır. Çünki Allah-təala buyurur ki, döyüş günü düşmənə arxa çevirənlər Allahın qəzəbinə gələr. Döyüş mövqeyini dəyişmək, başqa bir dəstəyə qatılmaq üçün arxa çevirməyin eybi yoxdur.[5] Başqa bir kəbirə günah sələm yeməkdir. Allah-təala buyurur ki, sələm yeyənlər yalnız şeytanın məsx etdiyi kəslərdir. Sələmçi şəxs Qiyamət günü qəbirdən divanə kimi qalxar. [6]

Bu təşbeh bir zümrənin gümanına əsaslanır. Onların fikrincə şeytan insanı özündən gedəcək vəziyyətə gətirir, cin onun ağlını əlindən alır. Yə`ni sələmçilərin ayağa qalxması divanələrin ayağa qalxması kimidir. Sələmçilik onların qəlbini daşlaşdırmış,

[1] bax: "Məryəm",32
[2] "Nisa",93
[3] "Nur",23
[4] "Nisa",10
[5] "Ənfal",16
[6] "Bəqərə",274

hallarını dəyişmişdir. Bə`ziləri bildirir ki, sələm yeyənlər Qiyamət zamanı günah yükünün ağırlığında məst insanlar kimi sağa-sola gedər, yıxılıb-durar. Yedikləri sələm qəlblərində böyüyüb onları ayağa qalxmağa qoymaz.[1]

“Məcməul-bəyan” təfsirində buyurulur ki, onlar yalnız şeytanın divanə etdiyi kəslər kimi ayağa qaldırılar. İbn Abbas və başqaları bildirirlər ki, belə bir sifət sələmçilərə məxsusdur.

Bə`ziləri düşünür ki, şeytan insanın ağlını əlindən almır, deyilənlər bir təşbehdir. Nəfs istəklərinin qalib gəldiyi insan zəifləyir və şeytan onu təhlükələrə sürükləyir. Belə bir hal yalnız vəsvəsələrlə baş tutur.

Başqa bir böyük günah sehr-cadudur. Allah-təala buyurur ki, onlar şeytanın oxuduqlarına uydular. Küfr edən Süleyman yox, şeytanlar oldu. Onlar insanlara sehr-cadu öyrətdilər. Harut və Marut adlı mələklər onlara nazil olanı kimsəyə öyrətmirdilər. Amma onlar bunu öyrənib ərlə arvad arasına ayrılıq saldılar. Mə`lum oldu ki, sehr-cadunu satın alanlar axirətdə fayda görməz.[2]

Zina da kəbirə günahlardandır. Allah-təala buyurur: “Allahdan qeyrisini mə`bud kimi çağırmayanlar, Allahın haram buyurduğunu öldürməyənlər haqsızlıq və zina etməz. Bu işləri görənlər günahının cəzasına çatar, Qiyamət əzabı ikiqat olar. Onlar zəliledici əzabda əbədi qalar.[3]

Kəbirə günahlardan başqa biri günah yolda and içməkdir. “Nəhayə” kitabında yazılır ki, günah yolda and içmək evləri viran qoyar. Allah-təala buyurur ki,

---

[1] "Təfsiri-Beyzavi"
[2] "Bəqərə",102
[3] "Fürqan",69

onlar Allahla əhdi və andlarını ucuz qiymətə satırlar və onlar üçün axirətdə bəhrə yoxdur.[1]

Cihad qənimətindən oğurlamaq da kəbirə günahdır. Allah-təala buyurur ki, qənimətdən oğurlayan kəs məhşər səhnəsinə oğurladığı şeylə gətirilər.[2]

Vacib zəkatın qarşısını almaq böyük günahlardan sayılır. Allah-təala buyurur ki, xalqı Allahın yolundan çəkindirənləri cəhənnəm odu gözləyir.[3]

Yalan şəhadət vermək və şəhadəti gizlətmək də böyük günahlardan sayılır. Allah-təala buyurur ki, şəhadəti gizlədənin həqiqətən də qəlbi günahkardır.[4]

Şərab içmək böyük günahlardan sayılır. Allah-təala şərab içməyi bütlərə pərəstişi qadağan etdiyi kimi qadağan etmişdir. Yə`ni hər iki əməl yanaşı olaraq qadağan edilir. Mə'lum olur ki, hər iki günahın cəzası eynidir. Bu ayəyə əsasən şərabxoru bütpərəst sayırlar.

Namazı və ya namaz üçün vacib edilmiş bir əməli bilərəkdən tərk etmək böyük günahdır. Allahın rəsulu (s) buyurur ki, namazı bilərəkdən tərk edən Allahla və Allahın rəsulu ilə əhdini pozmuşdur.

Əhdi pozmaq, yaxınlarla əlaqəni kəsmək böyük günahlardan sayılır. Allah-təala buyurur ki, Allahla əhd bağladıqdan sonra onu pozan, Allahın əmr etdiyi əlaqələri kəsən, yer üzündə fəsad törədən insanlar üçün lə`nət var, axirət evinin pisliyi də onlar üçündür.[5]

İmam Kazim (ə) buyurur ki, atamın buyuruqlarından sonra Əmr uca səslə ağlayaraq evimizdən çıxdı. O deyirdi: *“Öz rə`yi əsasında fətva*

---

[1] bax: "Ali-İmran",77
[2] bax: "Ali-İmran",161
[3] bax: "Tövbə",35
[4] bax: "Bəqərə",282
[5] bax: "Rə`d",25

*verən həlak oldu və siz Peyğəmbər (s) əhli-beyti (ə) ilə elm və fəzilətdə çəkişməyə qalxdınız.”*

Şübhəsiz ki, Əmr imamın müxaliflərini nəzərdə tuturdu. Onlar öz şəxsi rə`yləri əsasında hökm çıxarırdılar. Hansı ki, Qur`andan, Əhli-beytdən (ə) xəbərsiz idilər. Bizim alimlər “mənim fətvam” dedikdə, Qur`an və hədis əsasında gəldikləri qənaəti nəzərdə tuturlar. Müctəhidin rə`yi onun zəhmətlərinin məhsuludur. Əslində isə ortada heç bir şəxsi rə`y yoxdur.[1]

Altıncı rəvayət: Məhəmməd ibn Müslim nəql edir ki, imam Sadiqdən (ə) yeddi kəbirə günah olduğunu eşitdim. Bilərəkdən mö`mini öldürmək, pak qadını zinada ittiham etmək, cihad cəbhəsindən qaçmaq, İslam məmləkətinə hicrətdən sonra İslam hökmlərinin yada salınmadığı yerə qayıtmaq, yetimin malını haqsız yemək, sələmin haramlığını bildikdən sonra sələm yemək, müqabilində Allah tərəfindən cəhənnəm odu və`d olunmuş hər bir günah şirk kimidir.[2]

Yeddinci rəvayət: Übeydə ibn Zurarə deyir ki, imam Sadiqdən (ə) kəbirə günahlar haqqında soruşdum, həzrət Sadiq (ə) imam Əlinin (ə) kitabında yeddi kəbirə günah qeyd olunduğunu bildirdi: Allah küfr, günahsızı öldürmək, ağvalideynlik, sələmçiliyin haram olduğunu bilib sələm yemək, yetimin malını haqsız yemək, cihad cəbhəsindən qaçmaq, hicrətdən sonra İslam olmayan məmləkətə dönüş.

Ravi nəql edir ki, imamdan soruşdum ki, bu günahlar böyük günah sayılırmı? İmam buyurdu ki, bəli. Mən yetimin malını haqsız yeməyin və ya namazı tərk etməyin böyük günah olduğunu soruşdum. İmam buyurdu ki, namazı tərk etmək daha böyük günahdır.

---

[1] Şeyx Kuleyni, "Kafi", 2-285

[2] "Kafi",2-277

Soruşdum ki, nə üçün namazın tərkini böyük günahlar kimi qeyd etmədiniz? İmam cavabında buyurdu ki, Sənə ilkin olaraq hansı günahı xatırlatdım? Dedim ki, küfrü. İmam buyurdu: “Həqiqətən, namazı tərk edən kafirdir. Yəni heç bir səbəb və üzr olmadan namaz qılmamaq küfrdür.”

Müəllif deyir ki, bir şəxs namazı inkar etsə, yəni desə ki, namaz vacib deyil, o şəxs mürtəd və murdardır. Namazı inkar etmədən yerinə yetirməzsə, kafir və murdar deyil, günaha yol verib və ruhu murdardır.[1])

Kəbirə günahlarla bağlı yeddi rəvayət nəql olundu.

## *FƏQİHLƏRİN BƏYANATLARI*

Mərhum Ayətullah Ağa Seyid Əbülhəsən İsfəhaninin “Zəxirətul-ibad” kitabında yazılır:

**Sual:** İnsanın çəkinməli olduğu kəbirə sayılan günahları bəyan edin.

**Cavab:** Əllamə Hilli (r) “Qəvaid” və “Təhrir” kitablarında buyurur ki, müqabilində od və`d olunmuş günahlar kəbirə günahlardır.

Şeyx Təbərsi “Məcməul-bəyan” təfsirində səhabələrə əsaslanaraq bildirir ki, bütün günahlar özündən aşağı günaha münasibətdə kəbirə günahdır. Məsələn, naməhrəm qadını öpmək zinaya münasibətdə kiçik, ona baxmağa münasibətdə böyük günahdır.

Müxtəlif alimlərin rə`yinə əsasən, yetmiş yeddi kəbirə günah var. (Onlardan bə`zilərinin kəbirə olması qəbul edilmir): Xalqı azdırmaq, yalan, Allaha iftira, günahsızı öldürmək, yer üzündə fəsad, zülm, zalıma güvənmək, zalıma kömək, təkəbbür, namaz qılmamaq, zəkat ödəməmək, cihada getməmək, cihada gedənlərə mane olmaq, cihaddan qaçmaq, yetimin malını yemək,

---

[1] "Kafi",3-278

## Böyük günahlar

Allahın mərhəmətinə ümidsizlik, özünü Allahın qəzəbindən amanda bilmək, Qur`an hökmündən fərqli hökmlərə riayət etmək, gücü çatanın Həccə getməməsi, fitnəkarlıq, insanların arasını vurmaq, şərab içmək, ağvalideynlik, Qur`anın təkzibi kimi küfrə yol vermək, Allaha münasibətdə şirk, nifaq, Qur`an ayələrinin inkarı, Allahla düşmənçilik, peyğəmbərlə müxalifətçilik, məadın inkarı, məadın cismaniliyinin inkarı, dinin zəruri hökmlərinin inkarı, Allahın zikrindən üz çevirmək, Məkkədə, Məscidül-həramda zülm etmək, məscidə gedənlərin qarşısını kəsmək, pak qadını zinada suçlamaq, pak insanı həmcinsbazlıqda suçlamaq, möminlərə istehza, çirkin işlər, əhdi pozmaq, andı pozmaq, zina, həmcinsbazlıq, ğina (haram musiqi), qumar, dəf çalmaq, qadının qadınla həmcinsbazlığı, yalan and, yalan şəhadət, Kə`bəyə hörmətsizlik, Məkkəyə daxil olmaq istəyənin ehramı tərk etməsi, oğurluq, alim olmayan yerə getmək, ölmüş heyvanın ətini yemək, donuz əti yemək, Allahdan qeyrisinin adına kəsilmiş heyvanın ətini yemək, haram mal qazanmaq, ölçüdə və çəkidə əskiltmək, şəri üzr olmadan xalqın haqqını yubatmaq, israf, yersiz xərc, xəyanət, ləhvə (mə`nasız işlərə) məşğulluq, “lə’bə” (faydasız işlərə) məşğulluq, kiçik günahların davamı, bir-birinə haram olan qadınla kişinin bir-birinə toxunması, dəyyusluq, yə`ni insanın öz  zövcəsini başqalarının ixtiyarına verməsi, söz gəzdirmək, yaxınlarla rabitəni kəsmək, peyğəmbərə iftira, müsəlmanı haqsız yerə vurmaq, şəhadəti gizlətmək, müsəlmandan zalıma şikayət etmək, şəri dəlil olmadan həcci təxirə salmaq, kişinin öz zövcəsinə “mənə ana kimi oldun” deməsi (zihar), yol kəsmək, yəni quldurluq.

“Məfatihul-hidayə” və “Mişkatul-vilayə” kitab-larında mərhum Hacı Mirzə Hüseyn Şəhristanin “Üsuli-

din" kitabından altımış kəbirə günah zikr olunur: namazı tərk etmək (namaz qılmamaq), zəkat verməmək, xüms verməmək, Həcci tərk etmək (ölən vaxt ona "yəhudi və ya məsihi dinində öl" deyilər), mübarək ramazan ayı orucunun tərki, Allah bəndələrinə zülm və zalıma kömək (zalımlar qarşısında təvazö), şərab və istənilən məstedici bir şey içmək, haqsız yerə adam öldürmək, livat (bu günah zinadan da pisdir; bu günaha görə qətl və ya odda yandırılma nəzərdə tutulub), zina, sələm yemək, qeybət etmək və qeybəti dinləyib qarşısını almamaq, yalan danışmaq, ğina, mütrib musiqiləri dinləmək (ney, tənbur, dəf kimi ləhv alətlərindən istifadə haramdır), əskik satmaq, saqqalı qırxmaq (rəvayətlərdə nəql olunur ki, saqqal qırxmaq səbəbindən bir qövm məsx oldu; saqqal qırxmaq məcusi padşahların xislətidir; girami İslam Peyğəmbəri (s) bunu qadağan etmişdir), özü ölmüş və ya şəri qaydada kəsilməmiş heyvanın ətindən yemək (donuz kimi murdar heyvanın və ya dovşan kimi əti haram olan heyvanın ətindən yemək, ağvalideynlik, haqsız yerə şəhadət, qumarbazlıq (uduş biletlərindən istifadə, şəhadət veriləsi yerdə şəhadəti gizləmək, pak qadını zinada suçlamaq, yalan and (yalan and ömrü qısaldır, evi viran qoyur,) xəyanət və hiyləgərliklə xalqın malını yemək (məsələn, südə su qatmaq), din qardaşlarına münasibətdə təkəbbür, israfçılıq, cihaddan qaçmaq, Allah-təalanın mərhəmətindən ümidsizlik özünü Allahın əzabından amanda bilmək, kişinin ipək libas geyməsi (savaş meydanı istisnadır), kişilərin qızıl libas geyib, qızıl üzük taxması, qızıl və gümüş qabdan yemək üçün istifadə, söz gəzdirmək (xalqın arasında ixtilaf yaratmaq), nəziri, əhdi, andı pozmaq, heyz və nifas halında zövcə ilə yaxınlıq, arvadın ərin haqlarını, ərin arvadın haqlarını pozması, ibadətdə riya (xalqın diqqətini cəlb etmək üçün

ibadət), elmi mübahisələrdə həqiqəti qəbul etməyib əks mövqe tutmaq, qadının kişi libası geyməsi (eləcə də kişinin qadın libası geyməsi), rüşvət vermək, haqqı pozaraq rüşvət almaq (mə`murların zülmündən qaçmaq üçün rüşvət verməyin eybi yoxdur; məsələn, Seyyidüş-şühəda zyarətçilərinin gömrükdən keçməsi üçün rüşvət verməyin eybi yoxdur), Qur`anın ziddinə hökm çıxarmaq, yaxınlarla əlaqəni kəsmək (bu, ömrü qısaldır), sehr-cadu, cinlərin və ruhların ram edilməsi, heykəltəraşlıq, şərtlər ödəndiyi bir halda yaxşılığa də`vət və pislikdən çəkindirməkdən vaz keçmək, vəsiyyət edənin icazəsi olmadan vəsiyyətnaməni dəyişmək, şəri icazə olmadan vəqfi dəyişmək, məscidi, Qur`anı, Seyyidüş-şühəda türbətini murdarlamaq, məsciddə cənabət, heyz və nifas halında oturmaq (Məscidül-həram və ya Peyğəmbər məscidindən ötüb keçmək), murdar və ya murdarlanmışı paklamadan istifadə, heyvanla cinsi yaxınlıq, istimina (insanın özündən sperma xaric etməsi; bu çox zərərlidir), müsəlmanın qəbrini murdarlamaq, dəstəmazsız və ya cənabət halında Qur`ana toxunmaq (qadının heyz və nifas halında Qur`ana toxunması), cənabət, heyz və nifas halında Qur`anın vacib səcdəli surələrini oxumaq, səbəbsiz yerə vacib namazı pozmaq, müctəhidin hökmünü rədd etmək (bu, Allaha qarşı şirk kimidir), əti haram heyvanın südündən və ya yumurtasından istifadə (əti halal heyvanların cinsiyyət üzvlərindən istifadə), torpaq yemək (şəfa tapmaq məqsədi ilə Seyyidüş-şühəda türbətindən istifadə olar), naməhrəm qadının bədəninə və ya saçına baxmaq.

Əlbbəttə ki, haramlar və günahlar çoxdur. Onların hamısını sadalamaq imkanımız yoxdur. Müəyyən kitablarda bu mövzu geniş açıqlanmışdır.

**Üçüncü risalə**

Mərhum Molla Məhəmməd Baqir Məclisi (r) buyurur: "Atam mərhum Molla Məhəmməd Təqi Məclisi bə`zi kitablarında hədislərə əsaslanaraq kəbirə günahları iki qrupa bölür. Birinci qrupa qəti kəbirə günahlar daxildir. Allaha münasibətdə şirk, Allahın mərhəmətindən ümidsizlik, Allahın qəzəbindən özünü amanda bilmək, günahsızı öldürmək, ağvalideynlik, mö`min kişi və qadını zinada suçlamaq, yetimin malını haqsız yemək, cihad cəbhəsindən qaçmaq, sələmçilik, sehr-cadu, kahinlik, zina, livat, oğurluq (xüsusi ilə qənimətdən), yalan and, namaz, oruc və zəkat kimi vacib əmrlərin tərki, güc çatan halda həccə getməmək, yersiz şəhadət və şəhadəti gizləmək, məstedici içkilər içmək, müqaviləni pozmaq, Allah və insanlarla əhdi pozmaq, yaxınlarla əlaqəni kəsmək, hicrətdən sonra geri dönmək, Allaha, onun rəsuluna və mə`sum imamlara iftira, qeybət, böhtan. İkinci qrupa isə ehtimal olunan kəbirə günahlar daxildir. Müstəhəb işlərin tərki, ehtiyac duyulmadığı halda susuz yolçuları sudan məhrum etmək, sidiyə münasibətdə ehtiyatsızlıq, ata-ananın təhqiri üçün şərait yaratmaq, vəsiyyəti pozmaq Allahın qəzavü-qədərinə qarşı çıxmaq, Allahın müqəddəratına e`tiraz, təkəbbür, həsəd, mö`minlərlə düşmənçilik, Məkkə və Mədinə hərəmlərində mülhidlik, söz gəzdirmək, haqsız yerə mö`minin bədən üzvünü kəsmək, ölmüş və murdar heyvan ətindən yemək, kiçik günahın davamı, pisliyə də`vət və yaxşılıqdan çəkindirmək, yalan və və`də-xilaflıq, xəyanət, mö`minə lə`nət, mö`mini alçatmaq, mö`mini incitmək, xidmətçini layiq olduğundan artıq vurmaq, haqqı çatana su verməmək, yol kəsmək, ailəni sıxıntıya salmaq, təəssüb, zülm, həqiqət qarşısında bəhanə (dığallıq), ikiüzlülük, mö`mini alçaltmaq, mö`mində eyb axtarmaq, mö`mini məzəmmət etmək, mö`minə qarşı iftira, mö`mini

lə`nətləmək, mö`minə münasibətdə bədgümanlıq, mö`mini qorxutmaq, ölçünü və çəkini əskiltmək, yaxşılığa də`vət və pislikdən çəkindirmənin tərki, günahkarlarla bir məclisdə (xüsusilə şərab məclisində) oturmaq, dində bid`ət, bid`ətçi ilə yoldaşlıq, günahı kiçik saymaq, qumarbazlıq, haram yemək.

Mərhum şəhid buyurur: “Şəriətdə hədd qoyulmuş, əzab və`di verilmiş hər bir günah kəbirə günahdır. Məsələn, Allaha münasibətdə şirk, haqsız qətl, livat, zina, cihad meydanından qaçmaq, sehr-cadu, sələmçilik, pak qadını zinada suçlamaq, yetimin malını yemək, haqsız qeybət, yalan and, haqsız şəhadət, şərabxorluq, Kə`bəyə hörmətsizlik, oğurluq, müqaviləni pozmaq, hicrətdən sonra qayıdış, Allahın mərhəmətindən ümidsizlik, özünü Allahın əzabından amanda bilmək, ağvalideynlik.

## *Üçüncü fəsil*

## *KƏBİRƏ GÜNAHI NECƏ TANIMAQ OLAR?*

Mərhum Şeyx Ənsari ədalət risaləsində beş yol göstərir:

**Birinci yol:** Mö`təbər rəvayət; bu rəvayətdə bildirilməlidir ki, günah böyük günahdır. (Həmin kitabın ikinci fəslində müəyyən rəvayətlər və onların tərcüməsi verilmişdir.)

**İkinci yol:** Ayə və ya mö`təbər rəvayət; məsələn, bir günah haqqında deyilir ki, Allah-təala bu günaha yol verən üçün cəhənnəm əzabını vacib etmişdir.

**Üçüncü yol:** Allah-təala Qur`ani-məciddə müəyyən günaha yol verən üçün əzabın qəti olduğunu bildirir. Həzrət Əbdül-Əzimdən ikinci rəvayətdə həmin ayələrə işarə olunur.

**Dördüncü yol:** Ağıl və nəql yolu; ağıl və ya nəql təsdiqləyir ki, bir günah hansısa böyük günahdan daha ağırdır.

Məsələn bildirilir ki, mö`minin arxasınca danışmaq, onun qeybətini etmək zinadan ağırdır. Uyğun bəyanatdan anlaşılır ki, möminin arxasınca danışmaq da kəbirə günahdır. Heç bir rəvayətdə qeybətin kəbirə günah olduğu bildirilməsə də, onun zinadan ağır olması ilə bağlı bəyanat kəbirə günah olduğunu göstərir.

Başqa bir misal: Heç bir rəvayətdə müsəlmanların kafirlərin xeyrinə casusluğu böyük günah kimi qeyd olunmur. Amma rəvayətlərdə bildirilir ki, savaşdan qaçmaq kəbirə günahdır. Ağıla əsasən belə bir nəticə çıxarırıq ki, casusluq fərarilikdən daha zərərli olduğu üçün o da kəbirə günahdır.

Bir tikə çörəyə və ya bir neçə günlük rəyasətə xatir düşmənlərdən pul alıb onlara gizli mə`lumatlar ötürmək necə də pisdir. Bunun səbəbi dinsizlik, imansızlıq, nütfənin pak olmamasıdır. Bu qəbil günahlardan Allaha pənah aparaq. Qiyamət günü beləlləri üçün ağır cəza var.

**Beşinci yol:** Həmin günaha görə şahidlik haqqından məhrum edilmək. Əgər bir günaha görə günahkarın şəhadəti qəbul edilmirsə, demək həmin günah kəbirə günahdır. Bə`zi günahlara yol vermiş insana iqtida etməmək tapşırılır. Mə`lum olur ki, həmin günah böyük günahlardandır.

Rəvayətdə nəql olunur ki, ağvalideyn insana iqtida etmək olmaz. Bu qadağadan mə`lum olur ki, valideyni incitmək kəbirə günahlardandır. Hansı ki, heç bir rəvayətdə ağvalideynliyin böyük günah olması göstərilməmişdir.

## *Dördüncü fəsil:*

## *KƏBİRƏ GÜNAH HAQQINDA ALİMLƏRİN BUYURUQLARI*

Səid ibn Cübeyr və Mücahid deyir: Müqabilində axirət əzabı və`d olunmuş və dünyada da cəzası nəzərdə tutulmuş günah kəbirə günahdır.

İbn Abbas və bə`zi şiə alimləri bildirirlər ki, Allahın qadağan etdiyi hər bir işə mürtəkib olmaq kəbirə günahdır. Amma bu günahların bə`ziləri bə`zilərindən şiddətlidir. Məsələn, naməhrəmə baxmaq kəbirə günahdır. Amma bu günah naməhrəmi öpməkdən kiçikdir. Naməhrəmi öpmək özü böyük günahdır. Amma zinaya nisbətən kiçik sayılır. Naməhrəmlə zina etmək böyük günahdır. Amma ərli qadınla zina etmək daha ağırdır. Əgər ərsiz qadınla zina müqabilində yüz qamçı nəzərdə tutulmuşsa, ərli qadınla zina edən şəxs daşqalaq olunur. İnsan bə`zən narahat olmadan kiçik günahlara yol verir. Hansı ki, rəvayətdə günahın kiçikliyinə baxmamaq tapşırılır. İnsana tövsiyə olunur ki, günaha yox, kimin qarşısında günaha yol verdiyinə diqqətli olsun. Günahla üzbəüz dayanan xəcalət çəkməli, Allahın ne`mətlərinə şükr etməlidir.

Pərvərdigara, bizə tövfiq əta et, sənə itaətsizlik göstərməyək. Bizdə Sənin mə`murlarının sorğu-sualına cavab vermək gücü yoxdur. Cəhənnəm oduna da dözəsi deyilik. Pərvərdigara, zəifliyimizə rəhm et, bizi cəhənnəm odunda yandırma.

Mərhum Şeyx Bəhayi bildirir ki, böyük günahlarla bağlı fərqli fikirlər var. Məsələn:

1. Qur`anda bir günaha görə cəza və`d olunursa, bu böyük günahdır;

2. Müqabilində cəza, hədd nəzərdə tutulmuş günah böyük günahdır;

3. Dinə e`tinasızlıq kimi dəyərləndirilən hər bir günah böyük günahdır;

4. Haramlığı qəti dəlillərlə sübuta yetən günah;

5. Qur`an və sünnədə şiddətli şəkildə məzəmmət olunan günahlar;

6. İbn Məs`ud bildirir ki, "Nisa" surəsinin başlanğıcından otuz birinci ayəsinədək qadağa qoyulan günahlar böyük günahdır;

7. Bütün günahlar böyük günahdır. Çünki günah Allahın ziddinə atılan addımdır. Mərhum Təbərsi "Məcməul-bəyan"da belə bir fikirin şiə alimlərinə məxsus olduğunu bildirir;

8. Bir çox alimlər yeddi kəbirə günah olduğunu hesab edir;

9. Bir qrup alim iyirmi kəbirə günah olduğunu bildirir;

10. Bə`zi alimlər qırx kəbirə günah sadalayır.

## *Beşinci fəsil*

Şiə əqidəsinə əsasən yalnız ömür boyu kəbirə və səğirə günaha yol verməyənlər İslam Peyğəmbərinə (s) xəlifə və canişin ola bilər. Bunu isə bəşər yox, yalnız Allah müəyyənləşdirə bilər. Deməli, imam da insanlar yox, Allah tərəfindən tə`yin olunmalıdır. Sünnü əqidəsinə əsasən, imam insanlar tərəfindən tə`yin olunur.

Şiə əqidəsinə əsasən, xalqın xəlifə və imam tə`yin etmək haqqı yoxdur. Sünni əqidəsinə əsasən, Peyğəmbər (s) özü üçün canişin tə`yin etmədiyindən bu iş xalqın öhdəsinə düşür.

Sünnilərin xəlifələri icma əsasında tə`yin etmək baxışının heç bir əsası yoxdur. Belə bir icma yalnız həzrət Əli (ə) və Peyğəmbər (s) Əhli-beytinə (ə) qarşı pis münasibətdən qaynaqlanır. Uyğun təbliğat bu gün də

sünnilər arasında davam etməkdədir. Əgər insanlar azad olsaydılar, heç şübhəsiz Peyğəmbərdən (s) sonra kimsə ilə müqayisə olunmayacaq Əlini (ə) seçərdilər. Şücaət, zöhd, ibadət sahəsində də həzrət Əlinin (ə) misli olmamışdır. Bəli, həzrət Əli (ə) bütün kamilliklərlə başqalarından üstündür.

Bundan əlavə, Qədir-Xumda və başqa məqamlarda Peyğəmbər (s) həzrət Əlini (ə) xalqa öz canişini kimi tanıtdırmışdır. Ğədire-Xumda peyğəmbərin (s) xütbəsi üç saat davam etmişdir. Həzrət öz xütbəsində buyurmuşdur: “Mən kimin mövlasıyamsa, Əli (ə) də onun mövlasıdır. Sünni məzhəbindən olanlar insafsızlıq edir, bildirirlər ki, Peyğəmbər (s) üç saat davam edən xütbəsində yalnız həzrət Əlini (ə) dost kimi təqdim etmək istəmişdir. Yə`ni kim məni dost bilirsə, Əlini (ə) də dost bilsin. Şiələr sünnilərə bildirirlər ki, sadəcə dostluğu bildirmək üçün böyük bir cəmiyyəti Ərəbistan səhrasında qızmar günəşin altında üç saat yubatmaq mə`nasız olardı. Uyğun məqamda hökmən xilafət və canişinlik kimi mühüm bir məsələdən danışılmışdır.

Böyük alimlər Qədir-Xum hədisinin izahında dəlillər gətirir, şiə baxışının həqiqət olduğunu sübuta yetirirlər.

Bir sözlə, zəhərli təbliğat insanların ağıl və mühakiməsini o qədər kütləşdirdi ki, həzrət Əlini xəlifəlik və canişinliyə layiq bilmədilər. Bu təbliğatı aparanlar bilirdilər ki, əgər həzrət Əli (ə) Peyğəmbərə (s) xəlifə və canişin olarsa, onlar müsəlmanların beytül-malından istədikləri kimi faydalana bilməyəcəklər.

## *ƏDALƏTLƏ BAĞLI SON SÖZ*

Ədalətli şəxs kimdir, ədaləti necə müəyyənləşdirməliyik?

Ədalət dedikdə istənilən bir işdə orta həddi gözləmək nəzərdə tutulur. Əgər qəzəb və şəhvət kimi

qüvvələr ağıla tabe olarsa, insan ədalətli sayılar. Ədalətli şəxs o şəxsdir ki, onun qəzəb və şəhvət kimi qüvvələri Allaha iman gücü ilə cilovlansın. Belə bir insan kəbirə günaha yol vermir, kiçik günahın üzərində dayanmır.

Bəs adil şəxsi necə tanımaq olar? Ayətullah Bürucerdinin fətvasına əsasən, bunun bir neçə yolu var:

1.Qarşı tərəflə ünsiyyət sayəsində onun ədalətli olub-olmaması anlaşılır.

2.İki ədalətli şəxs üçüncü şəxsin ədalətinə şəhadət verir.

3.Bir qrup müsəlman bildirir ki, filan şəxs ədalətlidir. Məsələn, müəyyən bir cəmiyyətin bir şəxsin arxasında namaz qılması həmin şəxsin ədalətli sayıldığını göstərir.

## *İMAMIN (PİŞNAMAZIN) RİSALƏLƏRDƏ GÖSTƏRİLƏN ƏDALƏT ŞƏRTLƏRİ*

Pişnamaz həddi-büluğ, aqil, on iki imamçı şiə, ədalətli və halazadə olmalıdır. O namazı düzgün qılmalıdır. Əgər iqtida edən kişisə imam da kişi olmalıdır. İqtida edən yaxşını pisdən seçən uşaqdırsa, özü kimi digər bir uşağa iqtida edə bilər.

Öncə ədalətli tanınan imamın ədalətinə şübhə yaranarsa, o öz ədalətində qalır və ona iqtida etmək olar.

Mərhum Nəraqi "Meracus-səadət" kitabında buyurur: "Bil ki, ədalət fəzilətlərin üstünü, kamilliklərin şərəflisidir. Ədalət bütün kamillik sifətləri ilə şərtlənmişdir. Bəlkə də eynən kamilliklərdən ibarətdir. Necə ki, ədalətin ziddi olan zülm çirkin sifətlərlə şərtlənir. Ədalət insan nəfsində yaranmış bir səciyyədir, insan bu qüvvə vasitəsi ilə bütün sifətlərə münasibətdə orta həddi gözləyə bilir. Demək, bütün əxlaqi fəzilətlər və kamil sifətlər ədalətlə rabitəlidir. Əflatun deyir: "İnsan ədalət sifəti əldə etdikdən sonra nurani olur.

Ədalət vasitəsi ilə nəfsin bütün yönümləri işıqlanır. Nəfs baxışları genişlənir, insan anlayır ki, ondan nələr istənilib.

**Ədalət üç qisimdir:**

1. Bəndələrlə Xaliq arasındakı ədalət; ədalət güc çatan qədər orta həddi gözləməkdir. Allah-təala həyat vermiş, kamilliklər əta etmiş, hər bir canlının ehtiyacını ödəmiş, hər kəs üçün süfrə açmışdır. Dil bu ne`mətləri sadalamaqda acizdir. Axirət ne`mətləri isə daha üstündür. Göz beləsini görməmiş, qulaq beləsini eşitməmiş, qəlb beləsini duymamışdır. Bəli, Allah qarşısında insanın vacib vəzifələri var. Ədalətə əsasən, hər bir ne`mət müqabilində təşəkkür etmək lazım gəlir. Haqqı ödəməmək zülmdür. Ədalətli padşahın ehsanının mükafatı onun hakimiyyətinə duadır. Allah hər nədən ehtiyacsızdır. Amma bəndələrə vacibdir ki, mə`rifət əldə etsinlər, Allahın məhəbbətini qazansınlar, Onun əmrlərini yerinə yetirsinlər, peyğəmbərlərə itaət etsinlər. Bütün bu işlərdə tövfiq (yardım) də Allahdandır.

Hər bir bəndə ixtiyar sahibi olaraq günahlardan çəkinməyə borcludur.

2. İnsanlar arasında ədalət; İnsanlar qarşılıqlı hüquqlara riayət etməlidir. Əmanəti qaytarmaq, müamilədə insaflı olmaq, böyüklərə hörmət, məzlumlara kömək ədalətin tələblərindəndir. İnsan öz haqqına razı olmalı, kimsəyə zülm etməməli, imkan həddində din qardaşlarının haqlarını yerinə yetirməlidir. İnsan bilməlidir ki, hər bir yaranmışın Allah tərəfindən müəyyənləşdirilmiş haqları var və bu haqları yerinə yetirmək lazımdır.

Peyğəmbərdən (s) nəql olunmuş hədisdə bildirilir ki, mö`minin mö`min qarşısında otuz haqqı var:

1. Mö`min mö`minin təqsirini bağışlamalıdır.

2. Qərib insana təsəlli vermək, məhəbbət göstərmək lazımdır.

3. Mö`minin eybini örtmək lazım gəlir.

4. Mö`min büdrədikdə ona göz yumulmalıdır.

5. Mö`min üzr istədikdə onun üzrü qəbul edilməlidir.

6. Mö`minin qeybətini etmək qadağandır.

7. Mö`min mö`minin xeyrini bəyan etməli, nəsihətini əsirgəməməlidir.

8. Dostluğu qorumaq, dostluq şəraiti yaratmaq lazımdır.

9. Mö`minin haqlarını nəzərdə saxlamaq lazımdır.

10. Mö`min xəstələndikdə onu yoxlamaq lazımdır.

11. Mö`minin dəfnində iştirak etmək lazımdır.

12. Mö`minin çağırışına cavab vermək lazımdır.

13. Mö`min mö`minin göndərdiyi hədiyyəni qəbul etməlidir.

14. Mö`min mö`minin yaxşılığına mükafatla cavab verməlidir.

15. Mö`mindən mö`minə ne`mət çatdıqda şükr etməlidir.

16. Mö`min mö`minə yardım göstərməlidir.

17. Mö`min mö`minin namusunu qorumalıdır.

18. Mö`min mö`minin istəyini yerinə yetirməlidir.

19. Mö`min mö`minin sualına cavab verməlidir.

20. Mö`min səbir vurduqda ona "yərhəməkumullah" demək, mö`minin uyğun duasına "yəğfirəllahu ləkum" deyərək cavab vermək lazımdır.

21. Mö`minin itirdiyini tapmaq.

22. Onun salamını almaq.

23. Onunla yaxşı tərzdə danışmaq.

24. Onun verdiklərini yaxşı saymaq.

25. Onun andlarını təsdiqləmək.

26. Onunla dostluq etmək, düşmənçilikdən çəkinmək.

27. İstər məzlum, istər zalım olduğu vaxt ona yardım göstərmək. Zalım vaxtı yardım göstərmək dedikdə, onu zülmdən çəkindirmək nəzərdə tutulur.

28. Mö`mini düşmənə təhvil verməmək, onu tənha qoymaqla xar etməmək.

29.Mö`min şəxs özü sevdiyini mö`min qardaşı üçün də sevməlidir.

30. Mö`min şəxs özü üçün sevmədiyini mö`min qardaşı üçün də sevməməlidir.

3. Dirilərin ölülərə münasibətdə ədaləti. Dirilər ölülərin borcunu ödəməli, vəsiyyətlərini yerinə yetirməli, onlara dua etməlidirlər.

Deyilənlərdən aydın olur ki, hər bir insanın xoşbəxtliyi onun ədalətə münasibəti ilə müəyyənləşir. İnsan orta həddi gözləməsə heç vəchlə dünya və axirət səadətinə nail ola bilməz. Beləcə, orta həddi şüar etməli, elm, əməl və cəmiyyətdə həddi aşmamalıyıq. Bu prinsiplərə riayət etməyənlər peyğəmbərin qəddini qırır.

**Üçüncü risalə**

## *Birinci fəsil*

## *KƏBİRƏ GÜNAHIN SƏCİYYƏLƏRİ*

1. İmam Sadiq (ə) buyurur: *“Ne`məti əldən alan günahlar yersiz qiyamdır. Günahsız insanın qətli peşimançılıq gətirən günahlardandır. Zülm insanı bəlaya düçür edir. Şərabxorluq insanın abır-həyasını əlindən alır. Zina insanın ruzisini əskildir. Yaxınlarla rabitəni kəsən insanın ölümü tezləşir. Ata-ananı incitmək duanın qəbuluna mane olur.”*[1]

2. İmam Baqir (ə) buyurur: Həzrət Peyğəmbər (s) buyurmuşdur: *“Əgər məndən sonra zina rəvac tapsa, qəfil ölümlər artar. Ölçü və çəkini əskiltsələr Allah tərəfindən qıtlığa düçar edilərlər. Əgər zəkat ödəməsələr, torpağın bərəkəti əskilər. Haqsız hökm versələr zülm-sitəmə kömək etmişlər. Əhdi pozsalar Allah düşmənlərini onlara qalib edər. Yaxınlarla əlaqəni kəssələr Allah onların malını şər adamların əlinə salar. Yaxşılığa də`vət və pisliyə qadağadan çəkinsələr, mənim Əhli-beytimə (ə) tabe olmasalar Allah pis insanları onlara hakim edər. Onların yaxşıları da dua edəndə qəbul olmaz.”*[2]

3. İmam Sadiq (ə) buyurur: *“Qəlbi günah kimi qaraldan ikinci bir şey yoxdur. Həqiqətən, günah qəlbi bulaşdırar, ardıcıl yol verilən günahlar qalib gəlib onu alçaldar.”*[3]

4. İmam Sadiq (ə) buyurur: “Damarı səyridən, ayağı büdrədən, başı ağrıdan, xəstəlik gətirən yalnız günahdır. *“«Şura» surəsinin 30-cu ayəsində Allah-təala*

---

[1] "Kafi",2-447
[2] "Kafi",2-374
[3] "Kafi",2-268

*buyurur ki, yalnız öz əməllərinizə görə müsibətə düçar olursunuz. Allahın bağışladığı günahlar cəzalandırılan günahlardan daha çoxdur."*[1]

5. İmam Sadiq (ə) buyurur: *Əmirəl-mö`minin (ə) buyurmuşdur: "Əməllərin səni rüsvayçılığa çəkdiyi bir vaxt məbada gülərkən dişlərin görünə."*[2]

6. Əbu Bəsir deyir: İmam Sadiq (ə) buyurmuşdur: *"İnsan günaha yol verdiyi vaxt onun qəlbində qara bir nöqtə yaranar. Əgər tövbə etsə bu nöqtə məhv olar. Əgər günahını artırsa qəlbinin qaralığı artar və bütün qəlbini bürüyər. Bu haldan qurtuluş yoxdur."*[3]

## *İkinci fəsil*

## *GÜNAHKARLARLA YOLDAŞLIĞIN MƏZƏMMƏTİ HAQQINDA RƏVAYƏTLƏR*

1. İmam Sadiq (ə) imam Baqirin (ə) dilindən belə nəql edir: *"Atam Səccad (ə) mənə buyurdu: "Beş zümrə ilə yoldaş, həmsöhbət və dost olma."* Bu beş zümrənin kimlərdən ibarət olduğunu soruşdum. Atam buyurdu: "Yalançı ilə yoldaşlıqdan çəkin. O ilğım kimidir, uzağı yaxın, yaxını uzaq göstərər. Fasiqlə yoldaşlıqdan çəkin. O səni bir qarın yeməyə və ya ondan da aza satar. Paxılla yoldaşlıqdan çəkin. Çünki olanını sənə qıymaz, ehtiyaclı olduğun vaxt sənə yardım əli uzatmaz. Axmaqla yoldaşlıqdan çəkin. O sənə xeyir vermək istəsə də, anlamazlıqdan sənə zərər vurar. Yaxınları ilə əlaqəni kəsəndən çəkin. Mən belələrinə Qur`anda lə`nət oxunduğunu gördüm. "Məhəmməd" surəsinin 23-cü ayəsi, "Rə`d" surəsinin 24-cü ayəsi, "Bəqərə" surəsinin 27-ci ayəsi."[4]

---

[1] "Kafi",1-269
[2] "Kafi",1-269
[3] "Kafi",1-271
[4] "Kafi",2-376

2. İmam Sadiq (ə) buyurur: *“Allaha və Qiyamət gününə imanı olan kəs imamın təhqir olunduğu, mö`minlərə eyb tutulan məclisdə oturmasın.”*[1]

3. İmam Sadiq (ə) buyurmuşdur: *“Allaha qarşı itaətsizliyə yol verilən və söhbəti dəyişmək imkanı olmayan məclisdə əyləşmək mö`minə yaraşmaz.”*[2]

4. İmam Sadiq (ə) buyurur: *“Bid`ət əhli ilə (dinə bir şey artırıb, dindən bir şey əskildənlərlə) həmsöhbət olmayın, bir məclisdə oturmayın. Belə etsəniz onlardan sayılarsınız. Peyğəmbər (s) buyurur: “İnsan öz dostu ilə bir məzhəbdədir.”*[3]

### *Üçüncü fəsil*

## *ALLAH QARŞISINDA GÜNAHIN E`TİRAFI VƏ PEŞMANÇILIQ*

1. İmam Baqir (ə) buyurur: *“And olsun Allaha, günahı e`tiraf edənədək ondan qurtulmazsınız. Tövbə üçün peşmançılıq yetər.”*[4]

2. İmam Baqir (ə) buyurur: *“And olsun Allaha, insanlardan yalnız iki xislət istənilmişdir: Ne`mətin artırılması üçün onun e`tirafı, günahın bağışlanması üçün günahın e`tirafı.”*[5]

3. İmam Sadiqin (ə) səhabələrindən biri nəql edir ki, imam belə buyurdu: *“Həqiqətən, insan günaha yol verər və Allah bu günah vasitəsi ilə onu behiştə aparar.”* İmamdan buyuruğunun mə`nasını soruşdum. İmam (ə) buyurdu: *“O günah edər və daim bu günahın qorxusunu*

[1] "Kafi",2-377
[2] "Kafi",2-374
[3] "Kafi",2-375
[4] "Kafi",2-426
[5] "Kafi",2-426

*çəkər. Günaha görə özünə qəzəbləndiyindən Allah ona rəhm edib behiştə aparar.”*[1]

4. İmam Sadiq (ə) buyurur: *“Allah sevir ki, bəndə öz günahına görə bağışlanma diləsin. Günahı az olduğundan e`tinasızlıq göstərib tövbə qılmayanı Allah düşmən bilir.”*[2]

## *Dördüncü fəsil*

## *TÖVBƏ VƏ ONUN ŞƏRTLƏRİ HAQQINDA*

1. Vəhəbdən nəql olunur ki, bir gün şeytan həzrət Yəhyanın gözünə görünüb ona nəsihət vermək istədi. Həzrət Yəhya dedi: *“Sənin nəsihətinə ehtiyaclı deyiləm. Amma mənə insanların vəziyyəti haqqında xəbər ver.”* Şeytan dedi: “Bəni-Adəm bizim nəzərimizcə üç zümrədən ibarətdir:

a) Bə`ziləri sizin kimi mə`sumdur. Onlara ümidimiz olmadığından əl çəkib rahatlanmışıq. Bizim hiylələrimiz onlara tə`sir etmir.

b) Bəziləri isə bizim qarşımızda uşaq əlindəki top kimidir. Onu istədiyimiz tərəfə qovur və tam ixtiyarımızda saxlayırıq.

v) Üçüncü zümrə hamıdan çox bizi narahat edir. Onların üzərində ciddi çalışsaq da, onlar günaha yol verən kimi peşiman olur, tövbə qılır və bağışlanma diləyirlər. Onlara çəkdiyimiz əziyyət boşa çıxır. Növbəti dəfə onları aldatmaq istədikdə, yenə günaha sürükləndikdən sonra tövbə qılıb bağışlanırlar. Onlardan nə istədiyimizi alır, nə də ümidimizi üzə bilirik.

2. Əllamə Hilli (r) “Minhacul-kəramə” kitabında yazır ki, Buşr Hafi İmam Kazimin (ə) əli ilə tövbə etdi. Bir gün imam Bağdadda Buşrun mənzilinin yanından

---

[1] "Kafi",2-426
[2] "Kafi",2-427

keçərkən mənzildən çal-çağır sədaları eşitdi. Həmin vaxt Buşrun kənizi zibil atmaq üçün bayıra çıxmışdı. İmam kənizdən soruşdu: “Bu evin sahibi bəndədir, yoxsa azad?” Kəniz cavab verdi ki, azad. İmam (ə) buyurdu: “Düz deyirsən, əgər bəndə olsaydı öz ağasından qorxardı.”

Kəniz mənzilə daxil oldu. Buşr şərab süfrəsində əyləşmişdi. Kənizin yubanmasının səbəbini soruşdu. Kəniz cavab verdi ki, qapıdan ötən bir şəxs ev sahibinin ağa, yoxsa bəndə olduğunu soruşub və deyib ki, əgər bəndə olsaydı ağasından qorxardı.

Bu sözlər Buşra o qədər tə`sir etdi ki, süfrədən qalxıb ayaqyalın özünü imam Kazimə (ə) çatdırdı. İmamın vasitəsi ilə tövbə edib ağlar halda geri qayıtdı. Həmin gündən Buşr çirkin əməlləri tərk etdi və zahidlər sırasına qatıldı. Buşr ayaqyalın imamın hüzuruna getdiyi üçün “hafi”, yə`ni ayaqyalın ləqəbini aldı.

3. “Nəhcül-bəlağə”də nəql olunur ki, bir şəxs Əmirəl-mö`mininin (ə) hüzurunda “əstəğfirullahə” söylədi. İmam (ə) buyurdu: “Anan əzanda ağlasın, bilirsənmi istiğfar nədir? İstiğfar ali bir dərəcədir və onun beş mə`nası var: keçmiş pis əməllərə görə peşmançılıq, keçmiş əməllərin təkrar olunmayacağı ilə bağlı qərar, Allahla görüş gününədək xalqın haqlarının qaytarılması, tərk olunmuş vacib əməllərin yerinə yetirilməsi, bədənin haramdan cücərmiş ətinin qəm-qüssə ilə ərildilməsi və dəri ilə sümük arasında yeni ətin yaranması.

6. Günahın şirinliyini bədənə daddırdığın kimi ibadətin əziyyətini bədənə daddırasan. Yalnız bu şərtlər ödəndikdən sonra “əstəğfirullah” deyə bilərsən. Belə bir istiğfar həqiqi və kamil istiğfardır.

4. Müaviyə ibn Vəhəb nəql edir ki, imam Sadiq (ə) buyurdu: “Bəndə həqiqi tövbə etdiyi vaxt Allah onu dost

bilir, dünya və axirətdə onun eybini örtür.” Müaviyə ibn Vəhəb soruşur ki, eybləri necə örtür?” İmam buyurur: “İki müvəkkil mələyin yazdığı günahları yadından çıxarır, bədən üzvlərinə vəhy edir ki, günahları örtsünlər. Günaha yol verilən yerə vəhy olunur ki, sənin üzərində baş verən günahı ört. Belə ki, Allahla görüş zamanı onun günahına heç bir şəhadət verilmir.”[1]

5. Əbu Übeydə Əl-Həzza nəql edir ki, imam Baqir (ə) buyurdu: “Həqiqətən, Allah-təala bəndəsinin tövbə və qayıdışına şad olur. Səhrada dəvəsini və azuqəsini itirmiş şəxs onu tapanda necə sevinirsə, Allah öz bəndəsinin tövbəsinə bir o qədər sevinir.[2]

6. İmam Sadiq (ə) buyurur: “Həqiqətən, Allah aldadılmış və tövbəkar bəndəsini sevir. Günahkar tövbə etdiyi üçün üstün tutulur.[3]

---

[1] "Kafi",2-431
[2] "Kafi",3-435
[3] "Kafi",2-435

## *Beşinci fəsil*

## *TÖVBƏ VƏ ONUN FAYDALARI HAQQINDA BİR NEÇƏ HƏDİS*

1. İmam Sadiq (ə) buyurur: *“Bəndə günaha yol verdiyi vaxt Allah-təala ona yeddi saat möhlət verir. Əgər Allahdan bağışlanma diləsə ona günah yazılmaz. Bu saatlar ötsə və bəndə bağışlanma diləməsə günah yazılar. Həqiqətən də, mö`min günahdan iyirmi il sonra onu yada salıb Allahın dərgahından bağışlanma diləsə Allah onu bağışlayar. Kafir isə həmin saat günahını yaddan çıxarır.”*[1]

2. Əli ibn Rəab deyir: İmam Sadiqdən “başınıza gələnlər öz əməllərinizdəndir” ayəsinin təfsiri haqqında soruşdum. Dedim ki, həzrət Əlinin (ə) və ondan sonra ailəsinin başına gələnlərin səbəbi nədir? Axı onlar mə`sumdurlar. Sualımın cavabında imam buyurdu: “Həzrət Peyğəmbər (s) gün uzunu günah etmədiyi halda yüz dəfə Allahın dərgahına üz tutub tövbə qılırdı. Dostları günaha yol vermədiyi halda Allah onları çətinliyə salır ki, savab versin.”[2]

3. İmam Sadiq (ə) buyurur: “Həqiqətən, Allah bəndəsindən xeyir istədikdə günahına görə onu cəzalandırır, tövbəni ona xatırladır. Bəndəyə pislik istədikdə günahdan sonra ona ne`mət əta edir, tövbəni yadından çıxarır. Allah-təala buyurur ki, onları bilmədikləri yolla tədricən həlak edərik.”[3]

Sonda “Nəhcül-bəlağə”dən günahkarlar və onlara nəsihətlə bağlı xütbəni yada salırıq.

---

[1] "Kafi",2-437
[2] "Kafi",2-450
[3] "Kafi",2-452

## Böyük günahlar

Günahkarlar azğınlıq yolunda heç nədən çəkinmədən addım atır. Nəhayət, Allah onları günahlarına görə cəzalandırır, onları qəflətdən oyatmaq istəyir. Ölüm onları yaxaladıqda axirətə üz tutur, dünyaya arxa çevirirlər. Belə ki, əldə etdikləri dünya ləzzətlərindən fayda olmur. Çünki, dünya ləzzətlərini özləri ilə gətirə bilmirlər. Ölümün gəlişi ilə bütün arzu-istəklər puça çıxır.

Özümü və sizi belə bir sonluqda həzər qılmağa çağırıram. Qəflət yuxusundan oyanaq, dünyanın müvəqqəti ləzzətlərinə təslim olmayaq. Bəsirət odur ki, insan Allah, peyğəmbər və mə`sum imamların nəsihətləri barədə düşünsün, dünyanın vəfasızlığını başa düşsün, ibrətlərdən faydalansın. Doğru yolu tutarkən bu yolun eniş-yoxuşlarında özünü gözləsin, şeytana aldanmasın. Özünü islah etməmiş azğınlara yol göstərməsin.

Əziz oxucu! Qəflət yuxusundan oyan! Tələsmə, qarşına çıxan məsələlərdə Peyğəmbərin (s) buyuruqları haqqında yaxşı düşün. Peyğəmbər buyuruqlarına biganə insanlardan uzaq ol. Belələrini boşla. Təkəbbür, naz-qəmzə, eqoistliyi özündən uzaqlaşdır. Qəbrin haqqında düşün. Yolun oradan keçəsidir. Gördüyün işə görə cəzalanacaqsan. Nə əkəcəksənsə, onu da biçəcəksən. Öncədən göndərdiklərini Qiyamətdə əldə edəcəksən. Özünə yer hazırla, nə qədər ki, fürsətin var qarşıdakı gün üçün hazırlıq gör. Ey eşidən, həzər qıl, ey bixəbər çalış. Qiyamətin xəbərlərindən kimsə səni peyğəmbər və imamlar kimi xəbərdar edəsi deyil. Qur`anın qəti hökmlərindən qaça bilməzsən. Bu hökmlərə əməl edənlər razı qalar. Müxaliflər üçün cəza hazırlanmışdır. İbadətdə özünə əziyyət verən, əməlini zahirən xalisləşdirən şəxs aşağıdakı beş sifətdən tövbə etməmiş nicat tapmaz:

**Üçüncü risalə**

1. Allaha qarşı şirk; ibadət və pərəstişdə Allaha şərik qoşmaq. Qur`an buyurur ki, Allahın mərhəmətinə ümid bəsləyən saleh iş görməli, ibadətdə ona şərik qoşmamalıdır.[1]

2. İnsan bir başqasını öldürməklə qəzəbini aradan qaldırmamalıdır. Qur`an buyurur ki, mö'mini bilərəkdən öldürənin cəzası cəhənnəmdir.[2]

3. Başqalarının pis işini açıqlamaq. Qur`an buyurur ki, iman gətirənlərin eyblərini açanları dünya və axirətdə ağrılı əzab gözləyir.[3]

4. Dində bid`ət yaratmaqla xalqdan təmənna. Qur`anda buyurulur ki, arzu-istəyinin ardınca gedəndən də azğını kimdir? [4]

5. Xalqla riyakar rəftar, ikili danışıq. Yə`ni birinə üzdə dost deyib, arxada düşmənçilik etmək. Qur`an buyurur ki, ikiüzlü insanlar cəhənnəm odunun ən aşağı dərəcəsində yerləşər. [5]

Aşağıdakı məsəl haqqında dərindən düşün. Hər bir misal oxşar hadisələrin mahiyyətini açıqlayır. Heyvanlar ot və su axtarışındadır. Yırtıcılar daim başqalarına zərər vurmağa çalışır. Qadınların məqsədi düya həyatını bəzəməkdir. İnsan şəhvət və qəzəb qüvvələrinə təslim olduqda heyvanlarla bir səviyyəyə enir. Əgər dünya zinətini məqsəd seçsə, qadınlar zümrəsinə qatılır. Hər bir bəndə mö`minlərin sifətini soraqlamalıdır. Mö`minlər Allah qarşısında təvazökar, xalqa nəsihətçil və mehriban, Allahın qəzəbindən qorxaqdırlar.

---

[1] bax: "Kəhf",110
[2] bax: "Nisa",92
[3] bax: "Nur",19
[4] bax: "Qəsəs",50
[5] bax: "Nisa",145

## Böyük günahlar

Pərvərdigara, bizə bəyəndiyin və razı qaldığın işlərdə tövfiq ver. Pərvərdigara, bizə itaət və günahdan uzaqlıq tövfiqi əta et. Bizə xalis niyyət və yanında olanlara münasibətdə mə`rifət buyur.

# DÖRDÜNCÜ RİSALƏ

## *Qeybətin hökmləri*

### *QEYBƏTİN HÖKMLƏRİ*

Bismillahir-Rəhmani-Rəhim. Əlhəmdu-lillahi Rəbbil-Aləmin və səlləllahu əla Muhəmmədin və alihit-tahirin.

Həmd və sitayiş mö`minə ehtiramı vacib etmiş, onun qeybətini haram buyurmuş və belə bir qeybəti qardaş cəsədini yeməyə bərabər tutmuş Allaha məxsusdur.

Salam olsun Allahın məxluqunun ən üstünü olan son peyğəmbər Məhəmməd (s) Mustafaya.

Bə`ziləri başqaları haqqında pis sözlər danışır və bu günahın böyüklüyünü dərk etmir. Mö`minlərin qeybətini və onlar haqqında pis sözü haram kimi tanıtdıran və məzəmmət edən bə`zi Qur`an ayələri və hədislərə nəzər salacağıq. Bu ayə və hədislərlə tanış olan möhtərəm oxucular qeybətin necə böyük günah olduğunu anlayar, ondan həzər qılar və yol verdikləri qeybətə görə tövbə qılarlar. Qeybətə görə tövbə edən kəs qeybətini etdiyi şəxsdən razılıq almalıdır. Əlbəttə ki, qeybəti olunan şəxsdən razılıq alınması fəsada səbəb olmamalıdır. Fəsad ehtimalı olduqda ona heç nə deyilməməlidir və onun günahlarının bağışlanması üçün dua edilməlidir. Belə bir rə`y mərhum Ayətullah-üzma Hacı Ağa Hüseyn Təbatəbai Bürucerdinin fətvasına uyğundur.

## Qeybətin hökmləri

Bu risalə beş fəsil və bir sonluqdan ibarətdir.

**Birinci fəsil: Qeybətin həqiqəti və mə`nası**
**İkinci fəsil: Qeybətin haram olması dəlilləri**
**Üçüncü fəsil: Qeybət xəstəliyinin müalicə yolları**
**Dördüncü fəsil: Qeybətə icazə verilən məqamlar**
**Beşinci fəsil: Qeybətin və digər günahların tövbəsi**
**Sonluq: Dilə aid günahlar**

## *Birinci fəsil*

## *QEYBƏTİN HƏQİQƏTİ VƏ MƏ`NASI*

Rəvayətlərdən belə mə`lum olur ki, qeybət dedikdə, on iki imamçı şiə haqqında xalqa onu narazı salacaq sözlər demək nəzərdə tutulur.

Bu nöqsan onun cismində də, soyunda da, xasiyyət və əməllərində də ola bilər. Bir şəxs haqqında kordur, kardır, topaldır, bəstəboydur, uzundur, qaradır, ayı kimidir, narkamana oxşayır demək cismə aid olan qeybətlərdəndir.

Bir şəxs haqqında "filan günahkarın, filan fəhlənin, filan xəbisin oğludur" demək soyla bağlı qeybətlərdəndir. İnsanın danışıq və əməlləri haqqında deyilənlər də qeybətdir. Bir şəxsin əxlaqsız, paxıl, təkəbbürlü, zalım, riyakar, vəzifəpərəst, oğru, çox danışan olduğunu demək qeybət sayılır. Bir insanın libası, evi, əşyaları haqqında deyilənlər də qeybət sayılır. Məsələn, bir insanın evini yəhudi evinə oxşatmaq qeybətdir. Yuxarıda deyilənlər qarşıda sadalayacağımız rəvayətlərə əsaslanır:

1. Həzrət Peyğəmbər (s) buyurmuşdur: "Bilirsinizmi qeybət nədir? Qeybət odur ki, mö`min qardaşını onun xoşlamayacağı bir şeylə yada salasan." Bir şəxs soruşdu ki, ya rəsulullah, əgər dediyimiz eyb onda varsa necə?" Həzrət Peyğəmbər (s) buyurdu: "Əgər olanı desən qeybətdir, olmayanı desən böhtan!"[1]

2. Bir gün Peyğəmbərin (s) yanında "filankəs acizdir" dedilər. Həzrət buyurdu ki, qeybət etdiniz."[2]

---

[1] "Kəşful-reybə", Şəhid Sani, s.52

[2] "Kəşful-reybə", s.52

3. Bir gün Ayişə həzrət Peyğəmbərin (s) xidmətində bir qadınla bağlı dedi: “O bəstəboydur.” Həzrət (s) buyurdu: “Qeybət etdin.”[1] Başqa bir qadının adı çəkilərkən Ayişə onu “ucaboy” sifəti ilə yada saldı. Peyğəmbər (s) buyurdu: “Ağzındakını tüpür.” Ayişə tüpürdü və ağzından bir parça ət düşdü.[2]

4. Bir gün Peyğəmbərin (s) hüzurunda “filankəs çox yatır” dedilər. Həzrət buyurdu: “Qardaşının cəsədinin ətini yedin.” [3]

5. Bir gün Ayişə otağından çıxan qadına işarə ilə onun boyunun qısalığını bildirdi. Həzrət Peyğəmbər (s) buyurdu: “Onun qeybətini etdin.” [4]

Qeybət təkcə dilə aid deyil. İnsan istənilən bir vasitə ilə kiminsə nöqsanını qarşı tərəfə anlada bilər. Əgər qarşı tərəf on iki imamçı şiə olarsa, bu qeybətdir. Qeybət həm dil, həm işarə, həm də yazı ilə gerçəkləşə bilər.

Kinayə ilə də qeybət etmək mümkündür. Bə`zən kinayə daha pis sayılır. Əgər bir şəxs kiməsə işarə ilə “Allah bizi həyasızlıqdan hifz etsin.”-deyə söyləyərsə, bu qeybət olar.

Çox olur ki, kiminsə qeybətini etmək istəyən şəxs öncə riyakarlıqla onu tə`rifləyir. Tə`rif əsnasında həmin şəxsin eybi açıqlanır. Məsələn deyilir ki, filankəs çox yaxşı adamdır, amma zəmanə onu şeytana əsir edib.

Bə`ziləri qeybətdən öncə özlərini dərdli göstərirlər. Məsələn, deyirlər: “Onun halına acıyıram, abrı-həyası itib-getdi.” Hansı ki, insan dostunun arxasınca onu narahat edəcək sözlər deməz. Dosta xəlvəti dua olunmalıdır. Yuxarıda qeyd olunan qəm-qüssə və dua

---

[1] "Kəşful-reybə", s.61
[2] "Cameus-sadat", 2-294
[3] "Cameus-sadat", Nəraqi,2-294
[4] "Cameus-sadat",2-294

daxili bir rəzalətdən doğur. Şeytan belə şəxsi öz oyuncağına çevirir.

**Xatırlatma:** Bir çoxları müsəlmanın qeybətini eşidərkən e`tiraz etmirlər. Beləlləri qeybət edənin günahına şərikdir. Bu mə`nanı təsdiqləyən hədis ikinci fəsildə bəyan olunacaq. Qeybət eşidən şəxs qəlbən bu işə narazı olmalı və qeybətin qarşısını almalıdır. Əgər qeybəti saxlaya bilmirsə, məclisdən çıxmalıdır ki, günaha şərik olmasın. Məclisi də tərk edə bilməsə qəlbən narazı olmalı, maraqla qulaq asmamalıdır. Əgər bir şəxs dildə qeybətə qarşı çıxıb qəlbdə həmin qeybətə maraq göstərərsə nifaq əhlidir.

Demək, dindar insan qeybəti eşidərkən inkar mövqeyi tutmalı, deyilənləri rədd etməlidir. Qeybəti dinləyən şəxs həmin mö`mini müdafiə edərsə, Allah da ona yardım göstərər.

## *İkinci fəsil*

## *QEYBƏTİN HARAM OLMASI DƏLİLLƏRİ*

Mö`minin qeybəti dörd dəlilə əsasən haramdır: Qur`an dəlili, rəvayət dəlili, icma dəlili və ağıl dəlili.

**Birinci dəlil:** Qur`ani-məcidin altı ayəsi qeybətin haram olduğunu təsdiqləyir:

1. “Hucurat” surəsinin 11-ci ayəsində Allah-təala üç şeyi qadağan edir: istehza və məsxərə, qeybət və pisliyə danışmaq, mö`mini çirkin və pis ləqəblə çağırmaq. Ayədə buyurulur: “Ey iman gətirənlər, bir qövm digər bir qövmü məsxərəyə qoymamalıdır. Olsun ki, həmin qövm onlardan üstün ola. Qadınları məsxərəyə qoymasınlar. Olsun ki, məsxərəyə qoyulanlar onlardan üstündür. Mö`minlər sizin özünüz kimidir, onlara eyb tutmayın. Kimsəni pis ləqəblə çağırmayın. Mö`mini kafirin çağırıldığı ləqəblə çağırmaq pisdir. (Məsələn, iman gətirənə “ey yəhudi” deyə müraciət oluna.) Bu

günaha yol verən tövbə etməsə sitəmkarlar cərgəsində dayanar və onlardan sayılar.”

Sünnə əhlindən rəvayət olunur ki, yəhudi Həyy ibn Xətəbin qızı Səfiyyə həzrət Peyğəmbərin (s) zövcəsi idi. Bir gün bu xanım ağlar halda Peyğəmbərin yanına gəldi və belə ərz etdi: “Ayişə mənə deyir ki, ey iki yəhudinin qızı yəhudi.” Peyğəmbər (s) buyurdu: “Nə üçün demədin ki, atam Harun, əmim Musa və ərim Məhəmməddir?” [1] Ötən ayədə məsxərəyə qoymaq qadağan edildi. Növbəti ayədə buyurulur: “Kafir olanlar üçün bir neçə günlük dünya həyatı cilvələndi, onlar iman gətirənləri məsxərəyə qoyurlar. O kəsləri ki, təqva əhlidirlər, Qiyamət günü onlardan üstündürlər. Allah istədiyinə hesabsız ruzi verir.” [2]

2. “Hucurat” surəsinin 12-ci ayəsində Allah-təala üç şeyi qadağan edir: mö`minlərə münasibətdə bədgümanlıq, mö`minlərin işində təftiş, mö`minlərin arxasınca qeybət və pis danışıq. Ayədə buyurulur: “Ey iman gətirənlər, uzaq olun bir çox gümanlardan. Çünki bə`zi gümanlar günah və din qardaşına münasibətdə bədgümanlıqdır.”

Rəvayətdə nəql olunur ki, həzrət Peyğəmbər (s) “mö`min qardaşınıza münasibətdə xoşgüman olun” buyurmuşdur. İmam Sadiqdən (ə) nəql olunmuş rəvayətdə bildirilir ki, mö`min qardaşın işində pisliyə əmin olmayınca ona qarşı bədgüman olma. [3] Ayənin davamında buyurulur: “Mö`min qardaşının eyblərini araşdırma, işlərini təftiş etmə.” İmam Sadiq (ə) buyurur: “Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Mö`minlərin büdrəmələrini araşdırmayın. Kim mö`min qardaşında

---

[1] "Təfsiri-kəşşaf", 4-370; "Məcməul-bəyan", 5-136

[2] "Bəqərə",208

[3] "Kafi",2-362

eyb axtarsa, Allah onda eyb axtaracaq. Allahın eyb axtardığı kəs isə rüsvay olacaq.”[1]

Ayənin tərcüməsinin davamı: “Biriniz o birinizin qeybətini etməyin və arxasınca danışmayın. Gizli eybi faş etməyin. (Bu iş ölmüş qardaşın ətini yemək kimidir.) Sizlərdən biri ölmüş qardaşının ətini yeməyi xoşlayırmı? Şübhəsiz, bu işdən ikrah duyursunuz və ağlınız bu işin pis iş olduğunu hökm edir. Beləsə, Allahdan qorxun, belə bir günaha yol verməyin. Belə bir iş gördükdə dərhal tövbə qılın. Allah sizin tövbənizi qəbul edər, mərhəmət buyurar.”

3. “Allah kimsənin haqqında pis söz deyilməsini dost tutmur. Yalnız pisliyə danışan, zalımdan şikayətlənən məzlum istisnadır. Allah sizin pis sözlərinizi eşidir və cəzanızın qədərini bilir.”

Rəvayətdə nəql olunur ki, bir şəxs Peyğəmbərin (s) hüzurunda Əbu Bəkrə pis sözlər dedi. Birinci və ikinci dəfə səbr edən Əbu Bəkr nəhayət cavab verdi. Həzrət Peyğəmbər (s) ayağa qalxıb məclisi tərk etdi. Peyğəmbərdən (s) gedişi haqqında soruşduqda buyurdu: “Nə qədər ki, Əbu Bəkr cavab vermirdi, onun əvəzinə mələk danışırdı. Əbu Bəkr cavab verən kimi mələk getdi və şeytan gəldi. Şeytan olan yerdə qalmaq istəmədim.”

4. “Vay olsun iman əhlinin qeybətini edən, müsəlmanlar arasında söz gəzdirənin halına.” [2]

Bə`zi alimlər qeyd edirlər ki, “huməzə” dedikdə başqalarının başında, əlində və gözündə olan eybə işarə edənlər nəzərdə tutulur. Başqalarının eyblərini dilə gətirənlər isə “luməzə” adlanır. Başqalarında eyb axtarmaqda, onları məzəmmət etməkdə məqsəd çox

---

[1] "Təfsiri-nurus-səqəleyn",5-92

[2] "Huməzə",1

vaxt qürur olur. Bə`ziləri var-dövləti ilə fəxr edib, özünü yüksək tutur.

Ayənin təfsirində qeyd olunur ki, huməzə başqalarına tə`nə etmək, luməzə mö`minlərin arxasınca pis sözlər danışmaqdır. [1]

5. “Ey peyğəmbər, haqq və ya batil üçün and içənlərlə razılaşma. Onlar öz yalanları ilə xalq arasında rüsvaydırlar. Qeybət edənlərlə, tez-tez xalq haqqında pis söz danışanlarla, söz gəzdirənlərlə, paxıl, zalım və günahkarlarla razılaşma.” [2]

Ayədən mə`lum olur ki, qeybət edən şəxslə bir araya gəlmək olmaz. Onun pis sözlərini dinləmək qadağandır. İnsan, haqqında danışılan şəxsi müdafiə edib deməlidir: “Siz səhv edə bilərsiniz, həmin şəxsin başqa məqsədi ola bilər.” Belə ki, mö`min qardaşınızı gücünüz həddində müdafiə etməlisiniz.

Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Bir şəxsə müsəlman haqqında qeybət olunsa həmin şəxs haqqında danışılana yardım göstərə bilər. Yə`ni onu müdafiə edib, haqqında deyilən pis sözləri inkar edər. Alla-taala belə bir insana dünya və axirətdə yardım göstərər. Əgər qeybəti edilənə yardımı tərk etsə, Allah da onu dünya və axirətdə öz yardımından məhrum edər.” [3] Demək, mö`min mö`minin daimi yardımçısı olmalıdır. Digər bir rəvayətdə nəql olunur: “Mö`min mö`minin qardaşıdır və ona yardımı tərk etmir.

6. “Həqiqətən, mö`minlər haqqında pis söz yaymaq istəyənləri dünya və axirətdə ağrılı əzab gözləyir. (Onlar dünyada rüsvay olar, axirətdə odda yanar.) Allah bəndələrinin aşkar və gizli işlərindən tam xəbərdardır.

---

[1] "Məcməül-bəyan",5-538

[2] "Qələm",10

[3] "Mustədrəkul-vəsail",2-108

Siz isə bilmirsiniz." [1] Ayənin təfsiri ilə bağlı mərhum Şeyx Məhəmməd Nəhavəndi iki rəvayət nəql edir:

**Birinci rəvayət:** Həzrət Peyğəmbər (s) buyurmuşdur: "*Elələrini tanıyıram ki, sinələrinə vurulanda bu səsi cəhənnəm əhli eşidər. Onlar müsəlmanlarda eyb axtarıb pərdə götürənlərdir. Onlar insanların yol vermədiyi günahları hamıya yayırlar.*" [2]

**İkinci rəvayət:** "*Elə bir bəndə yoxdur ki, mö`minin eybini aça, amma Allah-təala qiyamətdə onun eybini örtə.*" [3]

İkinci dəlil: Qeybətin haram olması ilə bağlı Əhli-beytdən (ə) rəvayətlər nəql olunmuşdur. Bu rəvayətlərdən iyirmi dördünü qeyd edirik.

1. Həzrət Peyğəmbər (s) buyurmuşdur: "İnsan Qiyamət səhnəsinə gəldiyi vaxt əməl naməsində yaxşı əməllərini görməz. Soruşar ki, dünyada gördüyüm yaxşı işlər haradadır? Ona deyilər: "İnsanların qeybətini etdiyin, onların yaxşılıqlarını qeybətə çevirdiyin üçün yaxşı əməllərin məhv olub."[4]

2. Həzrət Peyğəmbər (s) buyurmuşdur: "Qiyamət günü bir şəxs səhnəyə gətirilər və Allah-təalanın hüzurunda əməl naməsi ona verilər. Həmin şəxs əməl naməsində yaxşı əməllərini görməyib deyər: "Pərvərdigara! Bu mənim əməl naməm deyil. Ona deyilər: "Allah-təala sənin zərrəcə yaxşı əməlini unutmaz. Əməllərinin məhv olmasının səbəbi insanların qeybətini etməyindir." Başqa birini gətirərlər. Həmin şəxs əməl naməsində gözləmədiyi həddə ibadətlər görüb deyər: "Pərvərdigara! Bu mənim əməl naməm deyil. Mən belə ibadət etməmişəm. Ona deyilər: "Doğrudan da

[1] "Nur",19
[2] "Təfsiri-Nəfəhatur-Rəhman"
[3] "Təfsiri-Nəfahatur-Rəhman"
[4] Deyləmi, "İrşadul-qülub", s.157

filankəs sənin qeybətini etdiyindən yaxşılıqları sənə verilib.” [1]

3. Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Həqiqətən, pisliyə danışmaq zinadan ağır günahdır. Zinaya yol verən peşman olub tövbə qılır. Allah da onun tövbəsini qəbul edir. Qeybət edən isə qeybətini etdiyi şəxsdən razılıq alanadək bağışlanmır.” [2]

4. Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Mö`minlərin arxasınca danışmaqdan çəkinin. Çünki qeybət və pisliyə danışmaq zinadan ağır günahdır. Zinaya yol verən peşman olub tövbə qılır, Allah da onun tövbəsini qəbul edir. Amma qeybət edən şəxs qeybətini etdiyi adamdan halallıq alanadək bağışlanmır.” [3]

5. Həzrət Peyğəmbərdən (s) nəql olunmuşdur ki, bir gün həzrət öz xütbəsində sələmi yada saldı. Peyğəmbər (s) sələmin ağırlığından danışıb buyurdu: “Həqiqətən, ribadan gələn bir dirhəm otuz altı zinadan ağırdır. Ribadan da ağırı bir şəxsi hörmətdən salmaqdır.” [4]

6. Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Müsəlman kişi və ya qadının qeybətini edən şəxsin qırx gün namaz və orucu qəbul deyil. Yalnız qeybəti olunan şəxs bağışladıqdan sonra ibadət qəbuldur.” [5]

7. Həzrət Peyğəmbər (s) buyurur: “Bir şəxs mö`min qardaşında olan eybi arxasınca dilə gətirərsə, Allah-təala bu iki şəxsi behiştdə bir araya gətirməz. Əgər mö`mində olmayan bir səciyyəni dilə gətirərsə, onlar arasındakı iffət qət olar, qeybət edən şəxs daim cəhənnəm odunda qalar.” [6]

---

[1] "Məkasibi-Şeyx Ənsari", s.40
[2] "Məkasibi-Şeyx Ənsari", s.40
[3] "İrşadul-qulub", s.157
[4] "Məkasibi-Şeyx Ənsari", s.40
[5] "Məkasib", s.40
[6] "Məkasib", s.40

8. Həzrət Peyğəmbər (s) buyurur: “Pisliyə danışmaqla insanların ətini yeyən bir şəxs halalzadə olduğunu düşünürsə, yanılır. Xalqın arxasınca pis sözlər danışmaqdan çəkinin. Qeybət və pis danışıq cəhənnəm itlərinin yeridir.”[1]

9. Həzrət Peyğəmbər (s) buyurur: “Mö`min qardaşının pisliyinə, onun eyblərini açmağa doğru hərəkət edən kəs atdığı ilk addımda cəhənnəmdədir. Yə`ni ilk addımdan Allah-təalaya qarşı çıxmışdır.” [2]

10. Həzrət Peyğəmbər (s) buyurur: “Həqiqətən insanların arxasınca pisliyə danışmaq hər bir müsəlmana haramdır. Həqiqətən, od çırpını yediyi tək pis danışıq yaxşılıqları yeyir.” [3]

Mərhum Şeyx Mürtəza Ənsari “Məkasib” kitabının qeybət fəslində “yaxşılıqların yeyilməsi” ifadəsi ilə bağlı buyurur: “Yaxşılıqların yeyilməsi dedikdə, onların aradan qaldırılması nəzərdə tutulur.”

11. Həzrət Peyğəmbər (s) buyurmuşdur: *“Küfrün ilk mərtəbəsi odur ki, bir şəxs mö`min qardaşı haqqında eşitdiyini onun zərərinə istifadə etmək üçün yadda saxlaya. Beləlari üçün axirət payı yoxdur.”* [4]

12. İmam Sadiq (ə) buyurur: *“Ata-babalarım nəql edir ki, Əmirəl-mö`minin (ə) buyurmuşdur: “Həqiqətən, Allah mö`mini kiçildən bir şeyi iki gözü ilə görüb, iki qulağı ilə eşidib danışan şəxs haqqında buyurmuşdur: “İman gətirənlərin pisliklərini ifşa edib yayanlar üçün ağrılı əzab var.”* [5]

13. *“Allah-təala həzrət Musaya vəhy etdi ki, mö`minin arxasınca pis sözlər danışan kəs tövbə etsə*

---

[1] "Məkasib", s.40
[2] "Məkasib", s.40
[3] "Məkasib", s.40
[4] "Məkasib", s.40
[5] "Kəşfül-Reybə", Şəhid Sani, s.58

*behiştə sonuncu daxil olar. Mö`minin pisliyinə danışan halda dünyadan gedən isə cəhənnəmə birinci daxil olar.”* [1]

14. Qeybəti olunanın günahları bağışlanar. [2]

15. Həzrət Əli (ə) buyurmuşdur: *“Bir-birinizə həsəd aparmayın, qəzəblənməyin, pisliyə danışıb qeybət etməyin. Siz Allah bəndələri bir-birinizə qardaş olun.”* [3]

16. Nəql olunur ki, bir şəxsin əməl naməsi əlinə veriləndə namədə gördüyü yaxşılıqları yada sala bilməz. Nə qədər düşünərsə anlamaz ki, bu işləri nə vaxt görüb. Ona deyilər ki, bu yaxşılıqların səbəbi insanların sənin qeybətini etməsidir. [4]

17. Həzrət Peyğəmbər (s) buyurmuşdur: *“Bir şəxs ramazan ayında bir müsəlmanın qeybətini etsə, tutduğu oruca əvəz verilməz.”* [5]

18. Həzrət Peyğəmbər (s) buyurmuşdur: *“Qeybət və pisliyə danışıq məclisi abad yox, xarab edər. Qulaqlarınızı qeybətdən qoruyun. Həqiqətən, qeybət edən və onu dinləyən şərikdir.”* [6]

19. Əmirəl-mö`minin (ə) buyurur: *“Həqiqətən, üç şey qəbr əzabına səbəb olar: söz gəzdirmək, qeybət etmək, yalan danışmaq.”* [7]

20. Həzrət Peyğəmbər (s) buyurmuşdur: *“Həqiqətən hifz edən mələk əməli yuxarı qaldırdığı vaxt bu əməl müqabilində günəş nuru kimi bir nur qərar verilər. Nəhayət bu nur səmaya çatar və mələk onu artırıb xalisləşdirər. Əməl keçməli olduğu qapıya çatdıqda gözətçi deyər: bu əməli sahibinin üzünə çırpın.*

---

[1] "Kəşful-Reybə", s.58

[2] "Məfatihul-hidayə"

[3] "Məfatihul-hidayə"

[4] "Məfatihul-hidayə"

[5] "Məfatihul-hidayə"

[6] "Məfatihul-hidayə"

[7] "Mustədrəkul-vəsail",2-106

*Mən qeybəti olunan şəxsəm, Rəbbim mənə əmr edib ki, qeybət edənin əməlini səmaya buraxmayım. Yə`ni, qeybət edənin əməli məndən ötüb Allaha tərəf ucalmasın.”* [1]

21. Ənəs deyir: Həzrət Peyğəmbər (s) buyurdu: *“Me`raca aparıldığım vaxt dırnaqları ilə üzünü cıran bir qövm gördüm. Cəbrəildən soruşdum ki, onlar kimdir? Dedi: “Onlar başqalarının qeybətini edənlər, xalqın abır-həyasını aparanlardır.”* [2]

22. Bərra deyir: Peyğəmbər (s) buyurdu: *“Ey dildə iman gətirib, qəlbən iman gətirməyənlər, müsəlmanların pisliyinə danışmayın, mö`minlərin eybini araşdırmayın. Müsəlman qardaşında eyib axtaran kəsdə Allah-təala eyib axtarır. Allahın eyb axtardığı kəs evində gizlənsə belə hörmətdən düşər.”* [3]

23. Ənəs deyir: Süleyman ibn Cabir deyirdi: Həzrət Peyğəmbərin (s) yanına gedib ərz etdim: Mənə elə bir yaxşı şey öyrət ki, Allah-təala tərəfindən mənfəət götürüm. Peyğəmbər (s) buyurdu: *“Əvvəla, yaxşı işləri kiçik sayma (çünki Allahın razılığı yaxşı işlərdədir), hətta həmin yaxşı iş su istəyənin qabına su tökməkdən ibarət olsa belə! İkincisi, iman qardaşlarınla xoşrəftar ol. Üçüncüsü, səndən uzaqlaşan yoldaşın haqqında pis söz danışıb onun qeybətini etmə.”*[4]

24. Həzrət Peyğəmbər (s) buyurmuşdur: *“Namazı düzgün olan, ailəsi böyük, var-dövləti az şəxs müsəlmanların qeybətini etməsə yanaşı barmaqlar kimi behiştdə mənimlə olar. Müsəlmanın öz eybindən xəbərsiz qalıb din qardaşında eyib axtarması, onun nöqsanlarını xalqa açıqlaması necə də pisdir. Nə üçün*

---

[1] "Kəşful-Reybə", s.53
[2] "Kəşful-Reybə", s.53
[3] "Kəşful-Rəybə", s.54
[4] "Kəşful-Rəybə", s.54

*öz gözündə tir görməyən iman qardaşının gözündə çöp axtarır?!”*[1]

İnsanlar öz eyiblərindən qəflətdə qalıb başqalarının eyiblərinə o qədər məşğul olurlar ki, hətta namaz qılmayan, saqqalını qırxıb, qızıl üzük taxan şəxs də ətrafdakıları dinsizlikdə suçlayır.

“Durərus-sünniyyə” kitabında İbrahim ibn Ədhəmdən belə nəql olunur: İbrahim ibn Ədhəm deyir: “Bir gün zahirən övliya olduğu hiss edilən bir neçə qonağım gəldi. Mən vaxtı qənimət bilib onlara dedim ki, sizin kimi Allahdan qorxmağım üçün mənə tövsiyə verin. Dedilər: “Sənə bir neçə nəsihət veririk:

1. Çox danışan insan qəlbindən yumşaqlıq gözləməsin. (Yə`ni az danış.)

2. Çox yatan insan gecələr ibadət umacağında olmasın. (Yə`ni az yat.)

3. Xalqla çox ünsiyyətdə olan şəxs ibadətdən şirinlik gözləməsin. (Yə`ni az ünsiyyətdə ol.)

4. Zalımlarla rabitədə olan şəxs möhkəm əqidə umacağında olmasın. (Yə`ni zalımla dostluq etmə.)

5. Xalqın qeybətini edib, pisliyinə danışan, yalana adət verən insan dünyadan imanla gedəcəyini gözləməsin. (Yə`ni qeybət etmə, yalan danışma.)

6. Xalqın razılığını qazanmaq istəyən Allahın razılığından ümidini üzsün. (Yə`ni Allahın razılığına önəm ver.)

İbrahim ibn Ədhəm deyir: “Qonaqların nəsihəti haqqında düşündüm və bu nəsihətlərdə əvvəlin və sonun elmini gördüm.”

Bu altı tövsiyəyə əməl edən şəxs Allahdan qorxar və bir daha günaha üz tutmaz: az danışmaq, az yatmaq, günahkarla az ünsiyyətdə olmaq, zalımdan uzaq qalmaq,

---

[1] "Cameus-səadat", Nəraqi, 2-305

qeybət etməmək və yalan danışmamaq, Allahın razılğını xalqın razılığından üstün tutmaq.

Üçüncü dəlil: Qeybətin haram olmasının üçüncü dəlili alimlərin yekdil rə`yidir. İslam alimlərindən heç biri qeybəti və pis danışığı caiz saymamışdır. Yalnız bir neçə məqam istisnadır. Bu məqamlar dördüncü fəsildə zikr olunmuşdur.

Dördüncü dəlil: Qeybət ağılın hökmü ilə də haramdır:

1.Özünə münasibətdə qeybətə razı deyilsənsə, başqasının da qeybətini etmə.

2.Təfriqə və ayrılığa səbəb olan işə yol verilməməlidir.

3.Faydası olmayan zərərli işə yol vermə, qeybət insanları hörmətdən salır, mö`minlərin qəlbində bir-birinə qarşı məhəbbəti puça çıxarır, nifaq yaradır.

Demək, ağıl hökm edir ki, bu ləzzətsiz günahdan uzaq olsun və bu yolla əbədi əzabdan qurtulsun.

*Sarımsaq üz tutub bir gün soğana*
*Dedi dözmək olmur sənin qoxuna.*
*Soğan dedi: Zəhər yağır sözündən,*
*Ay yazıq, xəbərin yoxdur özündən.*
*Qızıl gül bilirsən özünü, yoxsa,*
*Bəlkə ətir duyur kim sənə baxsa?*
*Gəl öymə özünü qohumsan bizə*

**Qeybətin hökmləri**

*Məndən də betərsən qalarsa düzə.*

***Üçüncü fəsil***

## *QEYBƏT VƏ PİSLİYƏ DANIŞIQ XƏSTƏLİYİNİN MÜALİCƏSİ*

Qeybətin iki növ müalicəsi var: qısa yolla və əhatəli.

Qeybətin qısa yolla müalicəsi üçün insan bəsirət gözünü açıb qeybət mövzusundakı ayə və hədislərin təhlilinə vaxt ayırmalıdır. Allahın qəzəbini və Qiyamət gününün əzabını yada salmaq, qeybətin dünyəvi zərərlərini xatırlamaq lazımdır. Qeybət qarşı tərəfin qulağına çata bilər və arada düşmənçilik yaranar. Qarşı tərəf də eyni cür cavab verib qeybətə əl atsa buna razı olmazsan. Özünə qıymadığını başqasına qıymamaq insanlıq vəzifəsidir. Bundan sonra insan dilini gözləyər və danışmazdan öncə yaxşıca fikirləşər. Bu yolla qeybəti tədricən tərk etmək olar.

Qeybətin əhatəli müalicəsində öncə qeybətin səbəblərini müəyyənləşdirmək lazım gəlir. Qeybətin bir sıra səbəbləri var:

1. İnciklikdən yaranmış qəzəb insanı qeybətə aparır. İnsan bu yolla qəzəbini soyutmaq istəyir.

2. Biri ilə düşmənçilik səbəbindən onun eyibləri zikr olunur.

3. Cəmiyyətin bir şəxsə hörmətini görəndə həsəd yaranır və insan qeybət etməklə qarşı tərəfi alçaltmaq istəyir.

4. İnsan bekarçılıqda insanların qeybətini etməklə vaxt keçirir. Əslində, onun kimisə alçaltmaq fikri olmur.

5. Qarşı tərəfə istehza qeybətə aparır.

6. İnsan başqalarını alçaltmaq vasitəsi ilə özünü böyütmək istəyir. O qarşı tərəfi təhqir etməklə öz üstünlüyünü önə çəkir.

Əgər bu səbəblər aradan qaldırılarsa, qeybət xəstəliyinə əlac olunar.

7. Bir pis işdə günahkar olmadığını sübuta yetirmək üçün insan qarşı tərəfi alçaltmaq istəyir.

8. Öz günahını yüngülləşdirmək üçün başqalarının da bu günaha yol verdiyini önə çəkən insan qeybətə aludə olur. Məsələn, haram mal yeyən biri başqalarının da haram yediyini izhar edir. Belə bir üzr günahdan da pisdir. Bu sayaq qeybətdə nəinki insan günahdan yaxa qurtarmır, hətta başqa bir günaha batır.

9. Dostlarla bir araya gəlmək də qeybət səbəbindəndir. Dostlar bir şəxsin qeybətini edərkən onlarla həmrəylik xatirinə insan qeybətə yol verir. Belə bir vəziyyətdə qeybət edən şəxs insanların razılığını Allahın razılığından üstün tutur.

10. Kiminsə sənin haqqında pis söz danışacağını güman edib onu qabaqlamaq istəyirsən və eyiblərini sadalayırsan. Bu yolla qarşı tərəfin deyəcəyi sözləri tə`sirsizləşdirmək istəyirsən. Əslində, bu işinlə Allah yanında e’tibardan düşürsən. Çünki zənn-gümana əsaslanıb kiminsə haqqında pis sözlər danışmaq qeybətdən başqa bir şey deyil.

11. Bə`zən insan bir şəxsə hansısa eyibinə görə can yandırıb öz təəssüfünü bildirir və beləcə günaha batır.

12. Bə`zən birinin eyibindən xəbər tutun insan Allahın razılığına xatir öz qəzəbini bildirir.

Bir çoxları bu iki qisim qeybəti lazımınca qiymətləndirmir. Onların nəzərincə mərhəmət və qəzəb səbəbindən Allahın razılığı yolunda başqalarının eyibini dilə gətirmək olar. Allahın razılığı üçün mərhəmət və qəzəb yaxşıdır. Buna baxmayaraq qeybət haramdır və

bəyənilmir. Mərhəmət və ya qəzəb səbəbindən bir başqasını alçaltmaq olmaz.

Əgər dilimizin ixtiyarınızı əlimizə alsaq, Allah-təalanın tövfiqi ilə özümüzü hifz edə bilərik. Əks təqdirdə qeybət bizi cəhənnəmə aparasıdır.

## *Dördüncü fəsil*

## *KİMİN QEYBƏTİNİ ETMƏK OLAR?*

Bilməliyik ki, müəyyən məqamlarda qeybət haram sayılmır. Məsələn, şəri hakim qarşısında şəhadət zamanı deyilənlər günah deyil. Hətta icazə verilən məqamlarda da qeybətdən çəkinmək faydalıdır. İcazə verilən məqamlarda qeybət edən şəxs buna vərdiş edib icazə verilməyən məqamlarda da başqalarının eyibindən danışa bilər.

Qeybətin haram olmadığı məqamlar:

1. Bir şəxsə zülm olunmuşsa, o haqqını ala biləcək şəxsə zalımdan danışa bilər. Bir şərtlə ki, məzlum zalımın başqa eyiblərini sadalamasın. Məsələn, bir şəxs döyülmüşsə, onu döyən şəxsdən tədbir görəcək tərəfə şikayət edə bilər. Amma əsəbləşib həddi aşmaq, zalımın başqa eyiblərini açıqlamaq olmaz. Unutmamalıyıq ki, məzlum yalnız tədbir görəcək şəxsə şikayət edə bilər.

2. Əgər caiz bir işdə məşvərət aparılırsa mövzudan kənara çıxmaq olmaz. Məsələn, bir şəxs soruşur ki, qızımı filankəsə verim, yoxsa yox? Belə məqamlarda qarşı tərəfi mövzu ilə bağlı mə`lumatlandırmaq olar.

3. Mö`mini tanımadığı bir günahkardan uzaqlaşdırmaq üçün ona zəruri həddə mə`lumat vermək olar. Bu işdə məqsəd mö`mini hifz etmək olmalıdır.

4. Xəstənin məxfi eyiblərini müalicə məqsədi ilə həkimə açıqlamaq.

5. İki şərtə riayət etməklə şahid və ya rəvayətçinin eyibini açıqlamaq: Qarşı tərəfin dediklərini rədd etmək

üçün həddində danışmaq; yalnız qarşı tərəfin göstərişinə əməl etmək istəyən şəxsə danışmaq.

6. Bir şəxs özünü başqa cür təqdim edirsə, dörd şərtlə onun kimliyini bildirmək olar. Həmin tərəf xilaf bir hökm versə, onun alim olmadığı bilinməsə, xalq ona sualla müraciət etsə, danışan qarşı tərəfi alçaltmaq fikrində olmasa.

7. Bir şəxs "topal", "keçəl", "uzun" kimi ləqəblərlə məşhursa, onu tez bir vaxtda tanıtdırmaq üçün bu ləqəblərdən istifadə etmək olar. Amma həmin şəxs ləqəblə yada salınmasını xoşlamazsa, bu işdən çəkinmək lazımdır.

8. Açıq-aşkar olan eyibi demək olar. Məsələn, bir şəxsi hamı şərabxor kimi tanıyırsa, bunu dilə gətirməyin eybi yoxdur.

9. Şər`i hakim qarşısında şəhadət vermək vacib olduğu vaxt tələb olunan həqiqətləri demək günah deyil. Əksinə, şəhadəti gizlətmək qadağandır.

10. Bid`ətçi və azğın insanlar haqqında danışmaq caizdir.

11. Kafirlərin, din düşmənlərinin qeybəti caizdir.

12. Bir şəxs öz əslini təhrif edirsə, onun kimliyini açıqlamaq haram deyil. Məsələn, bir şəxs özünü tanınmış alimin oğlu kimi tanıtdırırsa, onun yalanını açıqlamaq olar.

13. Kimsənin tanımadığı adam haqqında danışmaq haram deyil. Məsələn, bir şəxs deyirsə ki, bir nəfər qumar oynayırdı, bu haram deyil.

## *Beşinci fəsil*

## *QEYBƏTƏ TÖVBƏ*

Qeybətdən və digər günahlardan tövbə bir neçə ünvanla bəyan olunur:

## Qeybətin hökmləri

Tövbə bütün xeyirlərin əsası və açarıdır. Günahı tövbədən savayı yuyan bir şey yoxdur. Günahına tövbə qılmayan şəxs sitəmkarlardandır. [1]

Qur`an ayələri, hədislər, alimlər icması tövbənin zəruriliyini təsdiqləyir. Tövbə edən şəxs Allahın sevimlisidir.[2] Həzrət Peyğəmbər (s) buyurur ki, tövbə edən Allahın dostudur. [3]

"Üsuli-Kafi"də imam Baqirdən (ə) belə nəql olunur: "Qaranlıq gecədə azuqəsini itirib sonradan tapan şəxs necə sevinirsə, Allah öz bəndəsinin tövbəsinə daha artıq sevinir."[4] Tövbə Allaha qarşı günahdan üz çevirib ona ibadətə üz tutmaqdır. Tövbənin bə`zi qaydaları var: İnsan gördüyü işdən peşman olsun, dərhal günahdan uzaqlaşmaq qərarına gəlsin, gələcəkdə günahı təkrarlamaq fikrində olmasın.

Tövbə üçün əsas amillərdən biri günahkar dostlardan uzaqlaşmaqdır. Saleh insanlarla ünsiyyət insanı günahdan uzaqlığa sövq edir.

Birinci halda tövbə edən şəxs qəflət yuxusundan oyanır, öz azğınlığını görür.

İkinci halda insan doğru yol tutmaq qərarına gəlir, qəlbi dirilir.

Üçüncü hal hidayət halıdır. Tövbə edən şəxs günahdan üz çevirdikdən sonra doğru yola üz tutur.

Tövbə amilləri ilə tanış olaq:

1. İnsan əməllərini müsbət saymayıb onlara eyibli və qəbahətli baxsın.

2. Zahir və batinini günaha meyildən qorusun. Əgər bir şəxs tövbə etdikdən sonra keçmiş günahı yada saldıqda ləzzət alırsa, bu tövbə həqiqi tövbə deyil.

---

[1] bax: "Hucurat", 11

[2] bax: "Bəqərə", 222.

[3] "Cameus-sadat", 3-65

[4] "Kafi", 3-435.

Günah ləzzəti bir dəfəlik insan varlığını tərk etməyincə həqiqi tövbədən danışmağa dəyməz.

3. İnsan öz əməllərinin hesabını aparmalıdır. Bilməlidir ki, Allah onun əməllərindən razıdır, yoxsa yox. Əməlləri Allahın razılığına səbəb olduqda şükr etməli, günah olduqda tövbə qılmalıdır. Allah-təala buyurur ki, mən ən üstün şərikəm və məndən qeyrisini şərik tutanı seçdiyi şərikə tapşıraram.[1]

4. İnsan Allahı öz əməllərindən xəbərdar bilməlidir ki, günaha üz tutanda xəcalət çəkib dayansın.

Tövbənin müəyyən sütunları var və bu sütunlarsız tövbə qeyri-mümkündür:

1. Vacib əmrləri vaxtında yerinə yetirmək və qadağalardan çəkinmək. Əgər bir şəxs vəzifələrindən xəbərsizsə, dərhal təhsilə başlamalıdır.

2. Buraxılmış əməllərin qəzasını yerinə yetirmək. Qəzası olmayan peşimançılıq çəkib gələcəkdə günaha yol verməsə yetər.

3. Halal qida və libas sorağında olmaq. Bunların insan ruhuna böyük təsiri var.

4. Xalqın haqqını ödəmək, onları razı salmaq. Əgər peşimançılıq yolu ilə Allahın haqqı ödənirsə, xalqın haqqı onun öz razılığındadır. Əgər haqqı öhdənizdə qalmış şəxs ölmüşsə, bu haqqı onun övladına çatdırmaq lazımdır. Mal tələf olmuşsa onun qiymətini ödəmək lazımdır.

5. Nəfslə mübarizə aparmaq və bir daha günaha qayıtmamaq lazımdır. Əmrləri yerinə yetirmək, haramlardan çəkinmək zəruridir, bu yolda səbr etmək, razı qalmaq zəruridir.

Bu məqamda mərhum Ayətullah Bürucerdinin qeybətlə bağlı buyuruqlarını yada salmaq yaxşı olar:

[1] "Cameus-sadat",2-377.

## Qeybətin hökmləri

“Əgər bir şəxs bir müsəlmanın qeybətini edərsə, vacib ehtiyata əsasən fəsad törətməmək şərti ilə həmin müsəlmandan halallıq istəməlidir. Əgər mümkün olmasa, həmin şəxs üçün bağışlanma diləmək zəruridir. Əgər qeybət yolu ilə qarşı tərəfi alçaltmışsa, imkan həddində bu zərəri aradan qaldırmaq lazımdır.”

Aşağıda sual-cavab şəklində bə`zi məsələlər açıqlanmışdır:

**Sual:** Əgər bir şəxs “filankəs paxıl və təkəbbürlü adamdır” deyirsə, bunun hökmü nədir?

**Cavab:** Bu sözləri demək olmaz.

**Sual:** Əgər bir şəxs on iki imamçı şiə öldükdən sonra onun arxasınca bir söz deyərsə, hökmü nədir?

**Cavab:** On iki imamçı şiənin ölüsünün arxasınca danışmaq caiz deyil.

**Sual:** Bir şəxs “isfahanlılar və ya qumlular pis adamdır” deyərsə, bunun hökmü nədir?

**Cavab:** Buna icazə verilmir. Hər yerdə yaxşı və pis adamlar var. Ümumi şəkildə bir məntəqə əhlini pis saymaq olmaz. Belə danışmayın. Əgər bir məntəqə əhlindən narazı qalmısınızsa, həmin yerdə bə`zilərinin pis olduğunu deyə bilərsiniz.

Pərvərdigara, bizə eyiblərimizi göstər ki, başqalarının eyiblərini dilə gətirməyək.

Qeyd etməliyik ki, qeybətin günahı zinanın günahından ağırdır. Çünki qeybət zinadan daha zərərlidir. Zina edən şəxs özünə zərər vurursa, qeybətin zərəri bütün cəmiyyətədir. Qeybət nəticəsində insanlar arasındakı inam itir, ictimai rabitələr qırılır. Bütün bunlar İslam dininin prinsiplərinə ziddir. İslam ictimai bir dindir və insanlar arasında qardaşlığa sə`y göstərir.

Bunu da nəzərdən qaçırmayaq ki, hər günaha qoyun açıb dindarlıq iddiasında olanları dinlə bir tutmamalıyıq. Mühitin tə`siri altında bə`ziləri zahiri dindarlıqla

kifayətlənir və heç bir günahdan çəkinmir. Bə`zən də dini tə`limlərdən xəbərsizlik iman zəifliyi ilə nəticələnir. Bu səbəbdən də dini mədrəsələri artırmaq və insanların həqiqi dindarlığı üçün münasib şərait yaratmaq lazımdır.

# SONLUQ

## *DİLLƏ BAĞLI GÜNAHLAR*

Dillə bağlı günahlar çoxdur. Onlardan biri qeybət və mö`minlərin pisliyinə danışmaqdır. Bu günahın heç bir ləzzəti yoxdur. Az-az adamlar bu günahdan qoruna bilir. Qeybət xəstəliyinə yoluxanlar özünü müalicə etməlidir. İnsan daha çox öz eyibləri haqqında düşünməlidir. Başqasından sizə danışan şəxs sizdən də başqasına danışa bilər. Qeybətçil insandan uzaq olmaq lazımdır. Şeytan və əmmarə nəfsdən Allaha pənah aparaq. Bu amillər insan üçün çox təhlükəlidir.

Dil günahlarından biri də yalandır. Yalan hər bir şərin açarıdır. Bə`ziləri yalana o qədər vərdiş verir ki, bunsuz yaşaya bilməyəcəyini açıqlayır. Bütün bunların səbəbi iman zəifliyidir. Mö`min şəxs hansısa mənfəət səbəbindən yalan danışmır.

Dil günahlarından biri də küfrdür. Dini müqəddəsliklərə qarşı təhqir, Allah və Onun rəsulunun, Qiyamətin inkarı bu qəbildəndir. Dinin zəruri hökmlərini inkar etmək də küfr sayılır.

Qeybətdən çəkinin, yalan danışmayın, iftira yaxmayın, haqsız yerə şəhadət verməyin, küfrə səbəb olacaq sözlər danışmayın, vaxtınızı boş keçirməyin, qəlbləri incidəcək sözlərə yer verməyin.

Əslində, dil Allahın ən böyük ne`mətlərindəndir və insan Allahı zikr etməklə, xoş sözlər danışmaqla bu ne`mətin şükrünü yerinə yetirə bilər. [1]

Təbərrük olaraq risaləni "Nəhcül-bəlağə"dən bir xütbə ilə başa çatdırırıq. Həzrət buyurmuşdur: "Günahdan çəkinən, Allahın günahdan pəhriz ne`məti əta olunmuş insanlar günahkarlarla, Allah və Onun

---

[1] bax: "İbrahim",7

rəsuluna tabe olmayanlarla mehriban olsalar yaxşıdır. (Onların qeybətini etməsinlər, onlara böhtan atmasınlar. Əksinə, onların doğru yola gəlməsi üçün çalışsınlar, insanların eybini yaxşılığa də`vət və pisliyə qadağa ünvanında desinlər.) İman əhlinə şükür ruhiyyəsi hakim olmalı və onları günahkarların qeybətindən çəkindirməlidir.

Bəs mö`min qardaşının qeybətini edib onu yol verdiyi günaha görə qınayanın halı necə olur? Yada salmırmı ki, Allah onun günahlarını örtüb və Allahın bu işi mö`min qardaşın qeybətinə səbəb olan günahdan böyükdür. Axı özü günaha batdığı halda başqasını günaha görə necə qınayır?! Əgər həmin şəxsin günahından uzaq olmuşsa da, başqa bir günaha yol verib Allaha itaətsizlik göstərmişdir. Olsun ki, həmin günah mö`min qardaşın günahından da böyükdür. And olsun Allaha, böyük günaha yol verməmişsə də, kiçik günahla itaətsizlik etmişdir. İstənilən bir halda onun xalqın pisliyini dilə gətirməsi yol vermədiyi günahdan daha böyükdür.

Ey Allah bəndəsi, başqasında eyb axtarmağa, pisliyini dilə gətirməyə tələsmə. Həmin şəxs bağışlana da bilər. Özünü kiçik günahdan amanda bilmə. Olsun ki, həmin günaha görə cəzalanasan. Sizlərdən hər hansı biriniz bir başqasının eyibini bilsə, onu dilə gətirməkdən çəkinsin. Çünki öz eyiblərini daha yaxşı bilir. Başqasının batdığı günahdan uzaq olduğu üçün şükr etsin. Bu ne`mət müqabilində şükür ona başqalarının eybini dilə gətirməyə macal vermir.

Mö`minlərin arxasınca pisliyə danışmağın məzəmməti haqqında qələmə aldığı risalə h.q. 1418-ci ilin rəbiüs-sani ayının 26-da başa çatdı.

***Vəssalamu ələykum və rəhmətullah***

## Sonluq

*Ey pak Əhli-beytə (ə) davamçı olan,*
*Mö`minin hörmətin saxla hər zaman.*
*Mö`minin qeybətin gətirmə dilə,*
*Allahın əmrini yaxşıca dinlə.*
*Ayə, hədis, ağıl , həm də ki icma,*
*Qeybətə, pis sözə qoymuş qadağa.*
*Bil şeytan yoludur pisliyə hər söz,*
*Rəhmanın yolunda bağışlanma gəz.*

# Mündəricat

## Mündəricat

## Mündəricat